# AZƏRBAYCAN MƏKTƏBİ

*Elmi-nəzəri, pedaqoji jurnal*

**2016**
**№ 6 (676)**
*(noyabr-dekabr)*

**1924-cü ildən çıxır**

*Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1996-cı il tarixli Nizamnaməsi ilə təsdiq olunmuşdur. Ədliyyə Nazirliyi üzrə dövlət qeydiyyatı № 11/3165*



*Redaksiyanın ünvanı:*
*Az1025, Bakı şəhəri, A.Cəlilov küçəsi, 22 (Təhsil İnstitutunun II binası, otaq 410 )*

*Telefon/Faks*
*(012) 496-74-19*
*(012) 496-74-20*

*E-mail:*
*azarbaycan.maktabijurnali.24@mail.ru*



*Rekvizitlər:*
*Kapital Bankın Rabitə Filialı*
*h/h AZ83AIIB45810013441800004118*
*VÖEN: 9900003611*
*Bankın rekvizitləri:*
*Kod: 200189*
*m/hAZ37NABZ01350100000000001944*
*SWIFT: Bik AIIBAZ2X*

*Jurnal redaksiyada yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.*

**BU NÖMRƏDƏ**

***M e t o d i k a,   q a b a q c ı l   t ə c r ü b ə***



***B i r i n c i   T ü r k o l o j i   Q u r u l t a y***



***M o t i v a s i y a   v ə   İ K T***



**LİSENZİYA № 022589**

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı: Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş: 23**

---

**Jurnal redaksiyanın kompüter mərkəzində yığılıb səhifələnmiş, ARTİ-nin Təhsil Texnologiyaları Mərkəzində çap olunmuşdur.**

**В этом номере**



**In this number**

# AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENTİ İLHAM ƏLİYEVİN SƏDRLİYİ İLƏ NAZİRLƏR KABİNETİNİN 2016-CI İLİN DOQQUZ AYININ SOSİAL-İQTİSADİ İNKİŞAFININ YEKUNLARINA VƏ QARŞIDA DURAN VƏZİFƏLƏRƏ HƏSR OLUNMUŞ İCLASDA

## TƏHSİL NAZİRİ MİKAYIL CABBAROVUN ÇIXIŞI



- Möhtərəm cənab Prezident.

Hörmətli toplantı iştirakçıları.

Dünyada əlverişsiz iqtisadi proseslərin davam etdiyi, qonşu regionlarda silahlı münaqişələrin və qanlı terror aktlarının baş verdiyi bir dövrdə Sizin düşünülmüş siyasətiniz nəticəsində ölkəmizdə sabitlik qorunub saxlanılır, iqtisadi islahatlar getdikcə dərinləşir, dövlətimizin gücü və beynəlxalq nüfuzu durmadan artır.

2016-cı ilin doqquz ayı ərzində Azərbaycanın təhsil sisteminin inkişafı davam etdirilib, mühüm kəmiyyət və keyfiyyət dəyişiklikləri baş verib. Son bir il ərzində Təhsil Nazirliyi tərəfindən 2500 şagird yerlik 10 məktəb binası və ailə tipli 1 kiçik qrup evi inşa edilib, 6 internat məktəbində, 2 peşə liseyində, 2 kollecdə, 1 ali məktəbin tədris korpusunda əsaslı təmir, 468 məktəbdə isə əsaslı və cari təmir işləri aparılıb. Cari ilin 9 ayında bütün mənbələr hesabına ümumilikdə ölkə üzrə 29 məktəb tikilib, 485-i təmir edilib.

Cənab Prezident, Sizə məruzə olunduğu kimi, cari ildən etibarən 44 rayonu əhatə edən azkomplektli və qəzalı vəziyyətdə olan kənd məktəbləri modul tipli məktəblərlə əvəzlənəcək. Bu məktəblərin üstünlükləri azməsrəfli olması ilə yanaşı, qısa müddət (1 ay) ərzində istənilən relyefdə quraşdırılması, asan daşınması, şagirdlərin sayına uyğun olaraq sinif otaqlarının rahatlıqla azaldılıb-artırılmasıdır. Nazirlər Kabinetinin qərarı ilə bu il 6 belə məktəbin quraşdırılması üçün Təhsil Nazirliyinə 2 milyon manat vəsait ayrılıb. Növbəti ildə tələb olunan vəsait ayrılacağı təqdirdə, şagird sayı 100-dək olan bütün qəzalı azkomplektli məktəblərin problemini birdəfəlik həll etmək mümkündür.

Məlumdur ki, məktəbəhazırlıq mərhələsi uşaqların gələcək təhsil nailiyyət-

lərində müstəsna əhəmiyyət daşıyır. 2014-cü ildə Bakıda pilot layihə kimi başlanan məktəbəhazırlıq qruplarının fəaliyyəti bu ildən ümummilli proqrama çevrilib. Nazirlər Kabinetinin müvafiq qərarı ilə cari ildə ölkə üzrə 5 yaşına çatmış uşaqların 55 faizinin məktəbəhazırlığa cəlb edilməsi nəzərdə tutulur. 2020-ci ilədək bu rəqəmin 90 faizə çatdırılması planlaşdırılır ki, bu da dünyanın ən inkişaf etmiş ölkələrinin səviyyəsinə bərabərdir.

Təhsil müəssisələrinin maddi-texniki bazasının müasirləşdirilməsinə göstərdiyiniz diqqətin və aparılan islahatların nəticəsidir ki, ümumi təhsilin keyfiyyət göstəricilərində üç il ardıcıl olaraq müsbət dinamika təmin olunur. Belə ki, 2012-ci illə müqayisədə bütün imtahan fənlərindən müsbət qiymət almış IX sinif məzunlarının sayı 50 faizdən 2016-cı ildə 67 faizədək artıb. Bu artım ölkə üzrə əksər rayonlarda, xüsusən əvvəlki dövrdə davamlı olaraq aşağı nəticələr göstərən bölgələrdə də qeydə alınıb. Ötən il oktyabrın 12-də Zati-alinizin sədrliyi ilə keçirilən iclasda məruzə etmişdim ki, nəticələri orta respublika göstəricilərindən aşağı olan rayonlarda xüsusi layihə həyata keçiriləcək. Ali diqqətinizə məruzə edirəm ki, ötən illə müqayisədə imtahanlarda müsbət qiymət alanların sayında Astara rayonu üzrə 22 faiz, Ağcabədi rayonu üzrə 15 faiz, Sabirabad rayonu üzrə 14 faiz artım müşahidə edilib.

Bu irəliləyişlər özünü qəbul imtahanlarında da büruzə verir. Belə ki, 200-dən çox bal toplayan abituriyentlərin mütləq sayı 34 min 475 nəfər təşkil edib ki, bu da ötənilki göstəricidən təxminən 4 faiz, 2014-cü ildəki göstəricidən isə 9 faiz artıqdır. Son 3 ildə 500-dən çox bal toplayanların sayı 19 faiz, 600-dən çox bal toplayanların sayı isə 32 faiz artıb.

2016-cı ildə mülki ali təhsil müəssisələrinə bütün ixtisas qrupları üzrə rekord sayda – 35 min 304 nəfər tələbə qəbul edilib. Bu göstərici ötən illə müqayisədə 2 min 235 nəfər və ya 6,7 faiz çoxdur. Qəbul olanların sayının yüksəlməsi məktəb təhsilinin keyfiyyətinin və vətəndaşlarımızın şüurunda təhsilin bir dəyər kimi əhəmiyyətinin artdığını təsdiqləyir.

Mürəkkəb iqtisadi şəraitin hökm sürdüyü bir dövrdə Sizin Sərəncamınıza əsasən, müəllimlərin diaqnostik qiymətləndirilməsi prosesi 2017-ci ildə də davam etdirilərək, daha 26 rayonu əhatə edəcək və beləliklə, əməkhaqqı artırılan müəllimlərin sayı 100 minə çatdırılacaq.

Görülən tədbirlər pedaqoji fəaliyyətə marağı xeyli artırıb. Belə bir şəraitdə ümumtəhsil müəssisələrinə direktorların və müəllimlərin işə qəbulu üzrə qaydalar obyektivlik və şəffaflıq baxımından daha da təkmilləşdirilib. İlk dəfə olaraq məktəb direktoru vəzifəsinə işə qəbul mərkəzləşdirilmiş müsabiqə əsasında keçirilib, yerli icra hakimiyyəti orqanlarının rəyi də nəzərə alınaraq 232 nəfər direktor təyin olunub.

Bu il müəllimlərin işə qəbulu üzrə müsabiqədə iştirak etmək üçün rekord sayda – 32 min nəfər elektron ərizə ilə müraciət edib. Həmin rəqəm 2013-cü ildə müəllim olmaq istəyənlərin sayından 2 dəfə çoxdur. Müəllim peşəsinin ictimai statusunun artırılması istiqamətində aparılan siyasət daha bilikli və hazırlıqlı insanların bu peşəni seçməsinə stimul yaradır. Müsabiqənin nəticələrinə görə, 2 min 413 nəfər müəllim adını qazanıb.

Bu il iqtisadiyyatımızın bütün sahələrində idxalın yerli istehsalla əvəz olunması barədə tapşırığın icrası olaraq, məktəblilərə paylanılan 261 adda 6 milyon 623 min nüsxədə dərsliklərin hamısının nəşri ölkəmizdə həyata keçirilib. Eyni zamanda, son üç ildə təhsil müəssisələrinin büdcədənkənar gəlirlərinin 60 faiz artırılmasına nail olunub.

Ümumi təhsil pilləsi üçün elektron resurslardan pulsuz istifadə imkanları genişləndirilib. Hesabat dövründə 143 dərslik və metodik vəsait, videodərslər, digər elektron resurslar portala yerləşdirilib. Elektron portaldan istifadə edənlərin sayında artım müşahidə olunub. 2016-cı ilin birinci yarısında portala daxilolmaların ümumi sayı 750 min, cəmi kitab yükləmələrin sayı isə 350 minə çatıb.

Təhsil Nazirliyi ilə Kapital Bankın tərəfdaşlığı çərçivəsində “Azərbaycan üçün öyrət” layihəsinə start verilib. Müxtəlif peşə sahibləri vətəndaşlıq mövqeyini nümayiş etdirməklə, paytaxt və bölgə məktəblərində akademik dərs və fərdi inkişaf təlimləri keçirir, şagirdlərin bilik və dünyagörüşünü artırmağa çalışırlar.

Məktəblilərin fiziki hazırlığının yüksəldilməsi istiqamətində məqsədli layihələr davam etdirilib, onların müxtəlif idman növləri ilə birbaşa məktəblərdə məşğul olmasına şərait yaratmaq üçün iyulun 15-də Milli Olimpiya Komitəsi və Gənclər və İdman Nazirliyinin iştirakı ilə idman federasiyaları və nazirliyin rəhbərliyinin görüşü olub.

İqtisadiyyatın şaxələndirilməsi şəraitində peşə təhsili sisteminin yenidən qurulması, bu sahədə çevik idarəetmənin təmin edilməsi, işəgötürənlərin tələblərinə cavab verən peşəkarların hazırlanması məqsədilə Zati-alinizin 2016-cı il 20 aprel tarixli Fərmanı ilə Azərbaycan Respublikasının Təhsil Nazirliyi yanında Peşə Təhsili üzrə Dövlət Agentliyi yaradılıb. Agentlik qarşısında peşə təhsilinin infrastrukturunun və maddi-texniki bazasının müasirləşdirilməsi, təhsilin məzmununun yenilənməsi və nüfuzunun artırılması kimi mühüm vəzifələr qoyulub. Bu istiqamətdə eyni peşələr üzrə paralel kadr hazırlığı həyata keçirən peşə təhsili müəssisələrinin şəbəkəsinin rasionallaşdırılması ilə bağlı artıq təkliflər hazırlanıb və Nazirlər Kabinetinə təqdim edilib.

Möhtərəm cənab Prezident, Sizin iştirakınızla sentyabrın 14-də IT STEP akademiyasının açılışı ölkəmizdə informasiya texnologiyaları sahəsində ilk peşə-ixtisas təhsili ocağının yaranması ilə yadda qaldı. “Maksimum təcrübə, minimum nəzəriyyə” prinsipi əsasında təşkil olunan bu müəssisə təhsil sahəsində dövlət-özəl sektor tərəfdaşlığının nümunəsidir.

Koreya hökuməti və şirkətləri ilə avtomatlaşdırma, elektronika, avtomobil və inşaat sahələri üçün kadr hazırlayacaq Peşə Tədris Mərkəzinin növbəti ilin əvvəlində təməlqoyma mərasiminin keçirilməsi planlaşdırılır.

Qəbələ rayonunda beynəlxalq ekspertlərin iştirakı ilə kənd təsərrüfatı ixtisasları üzrə Regional Peşə Tədris Mərkəzinin yaradılması üzrə işlər həyata keçirilir, yeni tədris korpusu və emalatxanaların tikintisi uğurla davam etdirilir. Əlamətdar haldır ki, kənd təsərrüfatı ixtisasları üzrə dərs vəsaitlərinin hazırlanmasına BP şirkəti maddi dəstək verir.

Bu il ilk dəfə olaraq Bakı və Gəncə şəhərlərində yerləşən peşə təhsili müəssisələrinə şagirdlərin qəbulu prosesində şəffaflığı və vətəndaşların rahatlığını təmin etmək məqsədi ilə Təhsil Nazirliyi və “ASAN xidmət” arasında əməkdaşlıq çərçivəsində “ASAN peşə” layihəsi reallaşdırılıb, dövlət hesabına təhsil almaq istəyənlərin sənəd qəbulu “ASAN xidmət” mərkəzlərində aparılıb. Sevindirici haldır ki, bu il peşə təhsili müəssisələrinə qəbul olanların 20 faizinin orta attestat balı 4 qiymətindən yuxarı olub.

Ölkəmizin ali təhsil sistemində də institusional dəyişikliklər davam etdirilib. Regionların sosial-iqtisadi inkişafı proqramına uyğun olaraq, yeni istehsalat və xidmət sahələrinin ixtisaslı kadrlara ehtiyacını təmin etmək məqsədilə Sizin Sərən-

camınızla Qazaxda Bakı Dövlət Universitetinin, Zaqatalada isə Azərbaycan Dövlət İqtisad Universitetinin filialları təsis olunub.

Azərbaycanın yeni iqtisadi modeli ölkənin insan kapitalının keyfiyyətinin yüksəldilməsi yolu ilə milli iqtisadiyyatımızın rəqabət qabiliyyətinin artırılmasını tələb edir. Yeni təhsil klasterlərində yaradılacaq onlarla yeni ixtisas iqtisadi subyektlərlə və müəssisələrlə sıx əlaqədə fəaliyyət göstərməlidir.

Sizin razılığınız əsasında, ölkənin dayanıqlı inkişafına cavabdeh müvafiq dövlət qurumları ilə birgə təhsil proqramlarını və prosesini bölgələrimizin tələbatına uyğunlaşdırmaq məqsədilə işçi qruplarının yaradılmasını təklif edirik. Gəncə, Sumqayıt, Mingəçevir və Lənkəran dövlət universitetləri və onların tabeliyində olan digər təhsil müəssisələrinin bu sahədə prioritetliyini xüsusi qeyd etmək lazımdır. Regional universitetlərin inkişaf strategiyalarının yerləşdikləri bölgələrin sosial-iqtisadi inkişafı ilə uzlaşdırılması və Sizin qarşıya qoyduğunuz vəzifələrin yerinə yetirilməsinə cəlb edilməsi həmin ali məktəblərin həm məzunlarının işlə təminatı, həm də gələcək fəaliyyətlərinin möhkəm elmi bünövrəsi kimi çıxış edəcək.

Zati-alinizin Fransa Respublikasının Prezidenti Fransua Olland ilə 2014-cü il sentyabrın 4-də səsləndirdiyi Azərbaycanda fransız universitetinin yaradılması təklifi artıq bu il sentyabrın 15-də gerçəkliyə çevrilib, Azərbaycan-Fransız Universiteti (UFAZ) ilk tələbələrini qəbul edib.

Bu layihə ali təhsilimizin tarixində yeni səhifə açır, vətəndaşlarımıza xaricə getmədən aparıcı universitetlərin standartlarına uyğun keyfiyyətli təhsil almaq imkanı yaradır. Cari ildə 143 nəfər tələbə, o cümlədən onların 23-ü ödənişli əsaslarla dörd ixtisas üzrə (kimya mühəndisliyi, kompüter elmləri, geofizika mühəndisliyi, neft və qazın kəşfi və hasilatı) ingilis dilində tədrisə başlayıb. Həmin ixtisaslar üzrə Fransanın Strasburq və Renn 1 universitetləri ilə əməkdaşlıq qurulub, məzunlara iki (həm Azərbaycan, həm Fransa) diplomun verilməsi qərara alınıb.

Son illər ölkəmizdə xarici dildə tədris aparan ali təhsil müəssisələrinin və burada təhsil alan gənclərimizin sayının artması xüsusi qeyd olunmalıdır. Eyni zamanda, Azərbaycanın ali təhsil müəssisələrində təhsil alan 4200-dən çox əcnəbi tələbə üçün əlverişli şərait yaradılıb. Xarici dildə təhsil məzunlara əmək bazarında əlavə şanslar yaratmaqla yanaşı, ölkəmizin beynəlxalq miqyaslı təhsil mərkəzinə çevrilməsinə də xidmət edir.

Təhsil Nazirliyinin təşəbbüsü ilə yaradılmış və hazırda 12 ali təhsil müəssisəsinin iştirak etdiyi "Maarifçi" Tələbə Kredit Fondu aztəminatlı ailələrdən olan tələbələrə ilk təhsil kreditlərini təqdim edib. Layihənin innovativliyi ondan ibarətdir ki, Fond dövlət büdcəsindən vəsait cəlb etmədən həmin kreditləri maliyyələşdirir.

Bakıda yerləşən ali təhsil müəssisələrində təhsil alan tələbələrin ehtiyacı nəzərə alınaraq, Heydər Əliyev Fondunun dəstəyi ilə bütün dövlət ali məktəblərinin tələbələri üçün 1000 yerlik yataqxananın tikintisi həyata keçiriləcək. Artıq bununla bağlı layihələndirmə işlərinə başlanılıb.

Azərbaycan Dövlət Neft və Sənaye Universitetində cari ilin yanvarında Ukrayna və İsraildən olan tərəfdaş qurumların iştirakı ilə açılan Startap məktəbinin artıq ilk buraxılışı olub. Layihənin məqsədi Azərbaycanda Startap hərəkatına töhfə vermək, gənclərin innovativ ideyalarının biznes həllini tapmasına dəstək olmaqdır. Startap məktəblərinin əhəmiyyəti ondan ibarətdir ki, onlar məzunlarda "iş yerini tutmaq" deyil, "iş yerini yaratmaq" psixologiyasını formalaş-

dırır.

Digər ali məktəbimiz - Azərbaycan Dövlət İqtisad Universiteti “QS” beynəlxalq reytinq agentliyinin hazırladığı Şərqi Avropa və Mərkəzi Asiya regionunun universitetlərinin reytinqində 30 ölkənin iqtisadyönümlü universitetləri arasında dördüncü yeri tutub. Rusiya Federasiyasının Təhsil və Elm Nazirliyi ilə aparılan danışıqlar əsasında bu universitetin Dərbənd filialı müddətsiz lisenziya alıb.

Təhsil Nazirliyi elmi məlumatların təqdim olunması və təhlili sahəsində dünyada lider olan “Thomson Reuters” şirkəti ilə əməkdaşlıq Sazişi imzalayıb. “Thomson Reuters”lə əməkdaşlıq ali təhsil müəssisələrimizə və alimlərimizə dünya elminin məlumat bazası ilə işləmək, nəşrlərini yerləşdirmək üçün geniş şərait yaradır. Bununla yanaşı, müxtəlif ölkələrin tədqiqatçıları ilə əlaqələr qurmaq, istənilən elm sahəsi üzrə inkişaf tendensiyalarını müəyyənləşdirmək, beynəlxalq elmi dairələrdə tanınmaq və qlobal universitet reytinqlərində yüksəlmək imkanı verəcək.

Cənab Prezident, hazırda ali təhsil müəssisələrinin elmi fəaliyyəti dövlət büdcəsindən maliyyələşdirilmir. Universitetlərin maliyyələşməsinin yeganə mənbəyini təhsil haqları təşkil edir. Elmi fəaliyyətlə məşğul olanların yarısının ali təhsil müəssisələrində çalışdığını nəzərə alaraq, dövlət tərəfindən elmə ayrılan vəsaitin bölgüsündə universitetlərin də iştirak etmək hüququnun tanınması məsələsinin müzakirəsini vacib hesab edirik.

Təhsil sistemində hesabat dövründə idarəetmə və struktur islahatları davam etdirilib. Qeyd olunmalıdır ki, insanların rahatlığını və eyni zamanda şəffaflığı təmin etmək məqsədi ilə tərəfimizdən təqdim olunan bir sıra xidmətlər elektronlaşdırılıb. Onların arasında Bakı şəhəri üzrə uşaqların birinci sinfə qəbulu, ali təhsil müəssisələrində tələbə köçürmələri, xarici diplomların nostrifikasiya üçün qəbulu, tədris resursların internet portalında yerləşdirilməsi, məktəb direktorlarının və müəllimlərin işə qəbulu, peşə təhsil müəssisələrinə dövlət sifarişi ilə şagird qəbulu və s. qeyd etmək olar.

Möhtərəm cənab Prezident, təhsil sisteminin əsas məqsədi Vətəninin mənafelərini anlayan və müdafiə etməyə hazır olan layiqli vətəndaşın yetişdirilməsindən ibarətdir. Yalnız milli dəyərlərə və ənənələrə sadiq, savadlı vətəndaş Azərbaycanın müstəqilliyinin möhkəmləndirilməsində və inkişaf etdirilməsində iştirak etməyə qadirdir. Hər bir xalqın ali inkişaf nöqtəsi onun dövlətçiliyidir. Bu gün Azərbaycan xalqı Sizin rəhbərliyinizlə öz dövlətçiliyi ilə fəxr edir. Azərbaycan bu illər ərzində bir çox sınaqlardan keçib. Onlardan sonuncusu bu ilin aprelində oldu. Düşmən təxribatı bizim üçün - bütün Azərbaycan xalqı, rəşadətli silahlı qüvvələrimiz, hər bir vətəndaş üçün növbəti ciddi imtahan idi. Xalqımız bu imtahandan Sizin rəhbərliyinizlə alnıaçıq çıxdı. Düşmənə və bütün dünyaya göstərdi ki, tarixi torpaqlarımızın azad edilməsi qaçılmazdır, döyüş meydanında da, dinc həyatda da, olimpiya stadionlarında da Azərbaycan bayrağını yüksəklərə qaldıran gənc nəslimiz yetişib. Bu işdə Azərbaycan müəlliminin də danılmaz xidmətləri var.

Oktyabrın 4-də, Beynəlxalq Müəllimlər Günü ərəfəsində Siz Azərbaycan müəlliminin əməyinə yüksək qiymət verərək, bir qrup təhsil işçisini fəxri adlara və dövlət təltiflərinə layiq görmüsünüz. Buna görə bütün təhsil işçiləri adından Sizə öz dərin minnətdarlığımı bildirirəm.

Diqqətinizə görə təşəkkür edirəm.

**AZƏRTAC**



# MƏKTƏBƏQƏDƏR TƏHSİL BU GÜN

**Nərminə Alnağıyeva,**
***AR Təhsil Nazirliyi məktəbəqədər təhsil sektorunun müdiri***

Məqalədə ölkəmizdə mövcud olan məktəbəqədər təhsil şəbəkəsindən, məktəbəqədər müəssisələrdə son illərdə görülən işlərdən, təlim-tərbiyənin səviyyəsindən bəhs edilir. Məktəbəqədər təhsilə dair direktiv sənədlərdə qoyulan vəzifələr də xatırladılır.

***Açar sözlər:*** *məktəbəhazırlıq, inkişaf proqramı, metodik və təlim vəsaitləri, zəruri maarifləndirmə.*

***Ключевые слова:*** *подготовка к школе, программа развития, методические пособия и пособия по обучению, необходимая агитация.*

***Key words:*** *preschool, developmental programs, teaching and learning materials, the necessary awareness.*

Məktəbəqədər təhsil ailənin və cəmiyyətin maraqlarına uyğun olaraq, uşaqların erkən yaş dövründən intellektual, fiziki, psixi inkişafını, istedad və qabiliyyətinin üzə çıxarılmasını, sağlamlığının qorunmasını, estetik tərbiyəsini, təbiətə və insanlara həssas münasibətinin formalaşdırılmasını və məktəb təliminə hazırlanmasını təmin edir.

Hazırda ölkə üzrə 1722 məktəbəqədər təhsil müəssisəsi fəaliyyət göstərir, bu müəssisələrə 117,239 uşaq cəlb olunmuşdur. Uşaqların məktəbəqədər təhsillə əhatəsi 14% təşkil edir.

Son illərdə ölkəmizdə məktəbəqədər təhsilin inkişafına xüsusi diqqət yetirilir və bu sahədə genişmiqyaslı proqramlar həyata keçirilir.

Belə ki, 2007-2010-cu illəri əhatə edən Dövlət Proqramı, Bakı şəhəri və onun qəsəbələrinin sosial-iqtisadi inkişafına dair Dövlət Proqramı çərçivəsində Bakı şəhərində yeni məktəbəqədər təhsil müəssisələri inşa edilmiş, bəzi müəssisələrdə əsaslı təmir və bərpa-gücləndirmə işləri aparılmışdır. Eyni zamanda respublikanın digər şəhər və rayonlarında da məktəbəqədər təhsil müəssisələrinin bir qismində əsaslı təmir işləri aparılmışdır. Məktəbəqədər təhsil müəssisələri müvafiq avadanlıqlarla, texniki vasitələrlə, müxtəlif təlim vəsaitləri ilə təchiz edilmişdir.

Cəmiyyətin müxtəlif xarakterli problemlərinin həllində aparıcı rol oynayan Heydər Əliyev Fondu bu gün öz dəyərli təşəbbüsü ilə təhsil sisteminə öz töhfəsini verir. Heydər Əliyev Fondu tərəfindən məcburi köçkünlər üçün salınmış 83 qəsəbədə 50 uşaq bağçası tikilib istifadəyə verilmişdir. Bakı şəhərində də yeni məktəbəqədər təhsil müəssisələri inşa edilməklə, ehtiyacı olanlar əsaslı təmir olunmuşdur.

Azərbaycanda Məktəbəqədər təhsil sisteminin modernləşdirilməsinə XX əsrin sonlarından başlanılsa da, məqsədyönlü şəkildə əsaslı dəyişikliyin aparılması XXI əsrdə davam etdirilmişdir. Bu dəyişikliklərə, ilk növbədə 12 aprel 2007-ci il tarixdə "Azərbaycan Respublikasında məktəbəqədər təhsilin yeniləşdirilməsi Proqramı (2007-2010)"nın təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin sərəncam (2089 nömrəli) imzalamasından sonra başlanılmışdır. Həmin sərəncam bu sistemdə fundamental xarakter-

li işlərin əsasını qoymuşdur.

Təhsil sistemimizin qarşısında duran vəzifələrdən biri də Məktəbəqədər təhsilin müasir tələblər səviyyəsinə çatdırılmasıdır. Bu məqsədlə Azərbaycan Respublikası Nazirlər Kabineti tərəfindən “Məktəbəqədər təhsilin dövlət standartı və proqramı” təsdiq edilmişdir. Bu sənəd “Təhsil haqqında” Azərbaycan Respublikası Qanununa uyğun hazırlanmışdır. Burada göstərilmişdir ki, bu konseptual sənəd tabeliyindən, mülkiyyət formasından asılı olmayaraq ölkədə fəaliyyət göstərən bütün məktəbəqədər təhsil müəssisələrinə şamil olunur və bu tipli təhsil müəssisələrində məktəbəqədər təhsilin vəzifələrinin yerinə yetirilməsinə, tədris-metodik rəhbərliyin tələblərinə əməl olunmasına dövlət nəzarətinin həyata keçirilməsi təmin edilməlidir.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən təsdiq edilmiş “Azərbaycan Respublikasında məktəbəqədər təhsilin yeniləşdirilməsi Proqramı”nda deyilir: “Məktəbəqədər təhsilin məzmunca yeniləşdirilməsi məqsədilə məktəbəhazırlıq baxımından uşaqların fiziki, sosial, mənəvi, estetik və psixoloji inkişafı, dərketmə və nitq qabiliyyətlərinin yüksəldilməsi üzrə əsas tələbləri özündə ehtiva edən, həmçinin pedaqoji prosesin humanistləşməsini nəzərdə tutan məktəbəqədər təhsil üzrə milli kurikulum hazırlanmalı və müvafiq qaydada təsdiq olunmalıdır”.

2014-cü il fevralın 24-də Heydər Əliyev Fondunun prezidenti Mehriban Əliyevanın rəhbərliyi ilə Fondun yeni layihəsinin məktəbəqədər təhsil müəssisələrinin inkişafı proqramının təqdimatı keçirilmişdir. Proqram ölkənin bütün bölgələrində uşaq bağçalarının genişmiqyaslı tikintisi, yenidən qurulması, əsaslı təmirinin dəstəklənməsini nəzərdə tuturdu. Proqramın icrasını təmin etmək məqsədi ilə respublikanın bir çox regionlarında yeni uşaq bağçaları inşa edilmiş, məktəbəqədər təhsil müəssisələrinin əksəriyyətində yenidənqurma və əsaslı təmir işləri aparılmışdır.

Dövlət məktəbəqədər təhsil müəssisələri şəbəkəsinin genişləndirilməsi ilə yanaşı, ölkədə özəl sektorun da inkişafına böyük yer verilir. Əgər 2001-ci ildə yalnız 3 özəl məktəbəqədər təhsil müəssisəsi var idisə, indi bu növ müəssisələrin sayı 90-ı ötüb. Onlardan 1-i Sumqayıt şəhərində, 4-ü Abşeronda, 1-i Lənkəranda, qalanı isə Bakı şəhərində yerləşir.

Məktəbəqədər təhsilin inkişafı istiqamətində beynəlxalq təşkilatlarla aparılan işləri də qeyd etməmək olmaz.

Avropa Birliyinin maliyyə dəstəyi ilə Müasir Təhsil və Tədrisə Yardım Mərkəzi və Azərbaycana Birgə Yardım Təşkilatı tərəfindən 2012-2014-cü illərdə Sumqayıt şəhəri, Siyəzən, Biləsuvar və Lənkəran rayonlarında 17 özünədəstək qrupunda “Sosial Hüquqların İnkişafı – həssas təbəqədən olan və məktəbəqədər təhsilə cəlb olunmayan uşaqlar üçün icma əsaslı strategiyalar” layihəsi həyata keçirilmişdir.

UNİCEF və Təhsil Nazirliyinin əməkdaşlığı, Maliyyə Nazirliyinin dəstəyi ilə 2013-2014-cü illərin yay aylarında Yardımlı, Gədəbəy və Şabran rayonlarında məktəbəqədər yaşlı uşaqlar üçün 10 həftəlik məktəbəhazırlıq qrupları təşkil edilmişdir. Bu qruplara cəmi 3931 uşaq cəlb olunmuşdur. Layihənin məqsədi məktəbəqədər təhsilə cəlb olunmayan 5 yaşlı uşaqların məktəb təliminə hazırlanması idi.

2011-2013-cü illərdə 5 yaşlıların məktəbə hazırlığı işinin tənzimlənməsi üzrə BP şirkətinin maliyyə dəstəyi ilə Müasir Təhsil və Tədrisə Yardım Mərkəzi tərəfindən Şəmkir rayonunun Dəllər Cəyir, Dəllər Cırdaxan, Sabirkənd, Keçili və Qılıncbəyli kənd uşaq bağçalarında “İcma nəzdində məktəbə hazırlıq qruplarının təşkili” layihəsi həyata keçirilmişdir. Layihənin məqsədi məktəbəqədər təhsillə əhatə olunmayan 5 yaşlı uşaqların məktəbəhazırlıq üzrə

qısamüddətli təlim qruplarına cəlb olunması və onlara keyfiyyətli təhsil xidmətinin göstərilməsidir.

Layihələrin uğurla həyata keçirilməsi məqsədi ilə həmin layihələr tətbiq edilən məktəbəqədər təhsil müəssisələri Təhsil Nazirliyi tərəfindən müxtəlif metodik və təlim vəsaitləri ilə təmin olunmuşdur.

Hər bir layihənin tətbiqinə başlamazdan əvvəl tərbiyəçilər üçün müvafiq treninqlər keçirilmişdir.

Azərbaycan Respublikası Prezidentinin 24 oktyabr 2013-cü il tarixli Sərəncamı ilə təsdiq olunmuş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda məktəbəhazırlıq təhsilinin inkişafı üzrə irəli sürülmüş strateji hədəflərin reallaşdırılması məqsədilə 2014/2015-ci dərs ilində Bakı şəhəri üzrə müəyyən edilmiş 89 pilot ümumtəhsil məktəbində təşkil olunmuş qruplarda 3007 uşaq, 2015/2016-cı tədris ilində isə 135 ümumtəhsil məktəbində 4442 uşaq məktəbəhazırlıq mərhələsini keçmişdir. 2016/2017-ci tədris ilindən respublikanın bütün regionlarında 2695 dövlət ümumtəhsil məktəbində dövlət büdcəsinin vəsaiti hesabına məktəbəhazırlıq qrupları təşkil edilmişdir. Bu qruplara 85750 uşaq cəlb olunmuşdur. Məktəbəhazırlıq qruplarının yaradılmasında əsas məqsəd məktəbəqədər təhsil müəssisələrinə cəlb olunmayan uşaqların məktəbə hazırlığını təmin etməkdir. Həmin qruplarda işləyəcək müəllimlər üçün metodik və təlim vəsaitləri hazırlanmışdır.

Lakin, çox təəssüf ki, bu işlər heç də bütün rayonlarda eyni səviyyədə təşkil olunmur. Belə ki, aldığımız məlumatlara görə təhsil müəssisələrindəki məktəbəhazırlıq qruplarının uşaqlarını ümumtəhsil məktəblərində yaradılmış məktəbəhazırlıq qruplarına cəlb edirlər. Bu da uşaq bağçalarında uşaqların sayının azalmasına, nəticədə məktəbəhazırlıq qruplarının bağlanmasına, işçilərin işsizliyinə gətirib çıxara bilər.

Son illər məktəbəqədər təhsil müəssisələrinin normativ hüquqi bazasının təkmilləşdirilməsi məqsədi ilə bir sıra sənədlər hazırlanmış və Azərbaycan Respublikası Nazirlər Kabineti tərəfindən təsdiq edilmişdir. 2010-cu ildə "Məktəbə hazırlığın təşkili Qaydaları", "Məktəbəqədər təhsilin dövlət standartı və proqramı", 2012-ci ildə "Məktəbəqədər təhsil müəssisələrinin və uşaq evlərinin pedaqoji şuraları haqqında Nümunəvi Əsasnamə" və "Məktəbəqədər təhsil müəssisəsinin Nümunəvi Nizamnaməsi" təsdiq edilmişdir.

Azərbaycan hökuməti və Beynəlxalq İnkişaf Assosiasiyası (Dünya Bankı) arasında bağlanmış Maliyyələşdirmə Sazişi çərçivəsində təsdiq olunan Təhsil Sektorunun İnkişafı üzrə İkinci Layihənin "Kurikulum islahatının davam etdirilməsi və kurikulumun tətbiqinə dəstək" alt-komponentinin icrasını təmin etmək məqsədi ilə "Azərbaycan Respublikasında Məktəbəqədər təhsilin proqramı (kurikulumu)" hazırlanmışdır. Həmin təhsil proqramının (kurikulumunun) mahiyyətini məktəbəqədər təhsil işçilərinə çatdırmaq, onun tətbiqi ilə bağlı zəruri maarifləndirmə tədbirlərini həyata keçirmək üçün Bakı şəhərində UNİCEF-in dəstəyi ilə "Öyrədənlərin öyrədəni" təlim kurslarında təlimçilər hazırlanmışdır.

Məktəbəqədər təhsilin proqramının (kurikulumun) tətbiqi ilə bağlı pilot qaydasında respublikanın 15 şəhər və rayonunda (Gəncə, Sumqayıt, Mingəçevir, Abşeron, Gədəbəy, Qəbələ, Oğuz, Lənkəran, Yardımlı, Quba, Siyəzən, Şamaxı, Ağsu, Bərdə, Tərtər) 3093 nəfər məktəbəqədər təhsil işçisi üçün öyrədici təlimlər keçirilmişdir.

2015/2016-cı tədris ilindən ölkənin bütün şəhər və rayonlarında məktəbəqədər təhsilin kurikulumu üzrə 8275 nəfər məktəbəqədər təhsil müəssisələrində çalışan

pedaqoji işçi təlimlərdən keçirilmişdir.

Bir məsələni də diqqətinizə çatdırım ki, "Məktəbəqədər təhsil haqqında Azərbaycan Respublikasının Qanunu"nun layihəsi hazırlanaraq Milli Məclisə təqdim edilmişdir.

"Azərbaycan Respublikasında məktəbəqədər təhsilin dövlət standartları" sənədinin layihəsi hazırlanmışdır. Bu standartların əvvəlki standartlardan fərqli cəhəti odur ki, bütün inkişaf sahələri üzrə uşaqların 1 yaşdan 6 yaşadək dövrünü əhatə edir.

Məktəbəqədər təhsil sahəsində görülən işlərlə yanaşı, hələ də həllini gözləyən problemlər də var. Onların bir neçəsini qeyd etmək istərdim. Belə ki, ölkə üzrə məktəbəqədər təhsil müəssisələrinin sayı kifayət qədər deyil, əksər müəssisələrin, xüsusilə kənd rayonlarında əsaslı təmirə ehtiyacı var, maddi-texniki baza zəifdir, bəzi məktəbəqədər təhsil müəssisələrində məcburi köçkün ailələri yerləşib, ölkə üzrə məktəbəqədər təhsil müəssisələrinə uşaqların cəlbi faizi çox aşağıdır. Məktəbəqədər təhsil müəssisələrinin bir qismində müvafiq təhsili olmayan kadrlar yerləşdirilmişdir. Bu isə öz növbəsində keyfiyyətə mənfi təsirini göstərir. Rayonların əksəriyyətində kiçik komplektli məktəbəqədər təhsil müəssisələrinin üstünlük təşkil etməsi qruplarda müxtəlif yaşlı uşaqların birgə təliminə səbəb olur. Bu isə 5 yaşlı uşaqların məktəbəhazırlıqdan kənarda qalmasına gətirib çıxarır.

Ölkəmizdə prioritet sahə olan məktəbəqədər təhsilin inkişafı istiqamətində aparılan işlər həmişə dövlət dəstəyi, qayğısı ilə əhatə olunmuşdur. Buna cavab məktəbəqədər təhsilimizdə çalışan işçilərin də üzərinə məsul vəzifələr düşür. Ölkəmizə layiq gənc nəsil yetişdirilməsi hamının borcudur.

***Rəyçi: prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında məktəbəqədər təhsilin yeniləşməsi proqramı (2007-2010-cu illər). Xalq qəzeti, 2007-ci il, 12 aprel.

2. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.

3. Məktəbəqədər təhsilin proqramı (kurikulumu). Bakı: Təhsil, 2010.

4. Вагнер Л. Развитие позновательно способностей в процессе дошкольного воспитания. Москва: Педагогика, 1986.

5. Руднев Е. Первые шаги в новой должности. Москва, 2012.

**Н.Алнагиева**

**Дошкольное образование сегодня**

**Резюме**

В статье говорится о сети дошкольного образования, о проделанных работах в дошкольных учреждениях за последние годы, об учебно-воспитательном уровне. Упоминаются задачи, поставленные директевные документы о дошкольном образовании.

**N.Alnagiyeva**

**Pre-school education today**

**Summary**

In the article it is spoken about preschool network existing in the country, educational achievements and the level of education. In the article the duties in directive documents on preschool education are also reminded.



# TƏHSİLDƏ DƏYƏRLƏR

**Telman Qardaşov,**
***fizika–riyaziyyat elmləri namizədi***

Məqalədə təhsildə dəyərlər məsələsi qoyulur. Burada müəllim keyfiyyəti, şagirdlərin bilikli, savadlı olmağı, vətənpərvərlik tərbiyəsi, milli ruhda tərbiyə, şagirdlərin yad təsirlərdən qorunması məsələlərinə toxunulur.

***Açar sözlər:*** *təhsildə dəyərlər, müəllim keyfiyyəti, milli ruhda tərbiyə, yad təsirlər.*
***Ключевые слова:*** *образовательные ценности, качество педагога, воспитание в духе национальности, чужеродные влияния.*
***Key words:*** *educational values, teacher's quality, upbringing in the national spirit, external influences.*

Bakı şəhəri təhsil işçilərinin ənənəvi sentyabr konfransında çıxışı zamanı Təhsil naziri cənab Mikayıl Cabbarov 2016/2017-ci tədris ilinin "Təhsildə dəyərlər ili" kimi elan olunmasını təklif etmişdi. Əsas müddəalar milli-mənəvi ruhda təhsil, vətəndaş tərbiyəsi və peşəkar olmağın önəmi ilə bağlıdır. Təhsil nazirinin fikrincə, "Bu prosesə hazırlıq təhsildən başlayır və ailə ilə bərabər müəllimlərin timsalında gerçəkləşir. Dövrün çağırışı budur ki, biz təhsilalan gəncləri hansı səviyyədə hazırlaya bilirik? Müdrik kəlamda deyildiyi kimi, "Hər şey yoldan başlayır". Bu yolla hara gedirsən və məqsədin nədir? Müəllim bizə bu yolun başlanğıcını və məramını göstərən şəxsdir. Gələcəyin insanı bu məramla yetişir". Təhsildə bu dəyərlər ölkəmiz və ümumi təhsilimiz üçün çox vacibdir, ümumiyyətlə, təhsildə dəyər anlayışının məzmun və mahiyyəti təhsil sistemimiz üçün məqsəd və vəzifə kimi qəbul edilməlidir.

Təhsil sisteminin başlıca vəzifələrinə müvafiq olaraq, məktəblərdə milli-mənəvi və ümumbəşəri dəyərləri qoruyan və inkişaf etdirən geniş dünyagörüşünə malik olan, təşəbbüsləri və yenilikləri qiymətləndirməyi bacaran, nəzəri və praktiki biliklərə yiyələnən, müasir təfəkkürlü və rəqabətqabiliyyətli gənclər hazırlanmalıdır.

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda beş prioritet məsələnin biri yeni məzmunun yaradılmasıdırsa, deməli, dəyərlərə də məzmunda əks olunması vacib amil kimi baxılmalıdır. "Təhsildə dəyərlər"ə gündəlik vəzifə kimi yanaşılması ölkənin qarşısında duran müasir çağırışlara layiqli cavab verməyə doğru istiqamət almaq kimi başa düşülməlidir. Bunun mahiyyəti isə aşağıdakı kimi açıqlanmalıdır:

- şəxsə aid dəyərlər;
- sosial qruplara aid dəyərlər;
- milli dəyərlər;
- ümumbəşəri dəyərlər.

Heç kimə sirr deyildir ki, qeyd olunan dəyərlərin hamısı insanlarda təhsilvermə prosesi vasitəsi ilə yaradılır. Təhsildə dəyərlər anlayışına bu baxımdan yanaşıldıqda burada əsas məqsəd təhsilin dəyər funk-

siyasına qismən nəzər salmaq və təhsildə dəyərlər anlayışına aydınlıq gətirən bəzi məqamları şərh etmək zərurəti yaranır.

Təhsildə dəyərlər anlayışına işıq salan vacib məqamlardan biri şagirdə (təhsilalana) şəxsiyyət kimi yanaşmaqla bağlıdır. Şagirdin (təhsilalanın) arzuları, istəkləri, bilik və bacarıqları göz önünə alınmalı və tədris bu istiqamətdə aparılmalıdır. Məhz şəxsiyyət müasir dünyanın əsas hərəkətverici qüvvəsidir. Şəxsiyyət isə təhsil vasitəsilə yetişdirilir. Şagird (təhsilalan) təhsil prosesindən və təhsil mühitindən məmnun qalmalıdır. Təhsil prosesinin şagirdlərə (təhsilalanlara) aşılaya biləcəyi milli-mənəvi dəyərlər, vətənpərvərlik, işgüzarlıq və nizam-intizam Azərbaycanın sabit və dayanıqlı inkişafını təmin edəcəkdir.

Təhsildə dəyərlər anlayışına işıq salan digər məqamlardan biri də müəllim keyfiyyəti ilə bağlıdır. Bu da gələcək nəslin vətəninə, torpağına, millətinə bağlı əsl vətəndaş kimi yetişməsinə böyük təsir göstərir. Müəllim məsləhətçi statusunda olmalı, müntəzəm öz peşəkarlıq səviyyəsini artırmalı, tədrisdə ənənəvi şaquli öyrənmə metodu üfüqi öyrənmə ilə əvəzlənməli, ölkəmizin müasir çağırışlarına layiqli cavab verməlidir. “Təhsildə dəyərlər anlayışını fəaliyyətimizin yol xəritəsinə çevirməliyik” (M.Cabbarov).

Təhsildə dəyərlər anlayışına işıq salan ən mühüm məqamlar isə Azərbaycan Respublikası Prezidenti cənab İlham Əliyevin Sabunçu rayonunun 148 və 311 nömrəli tam orta məktəblərindəki çıxışlarında öz əksini tapmışdır. Həmin çıxışlardakı əsas müddəalar məktəbdə təhsilin dəyərlər üzərində qurulması üçün proqram xarakteri daşıyır və təhsildə dəyərlər anlayışının ən ali səviyyədə təqdimatıdır. Cənab prezidentin çıxışları şəxsiyyətin tamlığı vətənpərvərlik, dövlətçilik, milli-mənəvi dəyərlərə bağlılıq, bəşəri dəyərlərə hörmət aşılamaqla bağlıdır. Cənab prezident təhsilimizin şagidlərə (öyrənənlərə) aşağıdakı mühüm dəyərləri aşılamağını tövsiyə etmişdir.

Tələb aydındır: Təhsil elə təşkil olunmalıdır ki, şagirdlərimiz bilikli, savadlı olsun, gələcəkdə həyatda özləri üçün layiqli yer tutsunlar və eyni zamanda, ölkəmizin ümumi inkişafına da öz töhfəsini versinlər. “Bunun üçün tədris proqramları və dərsliklər milli məzmunda qurulmalı, təlim dilindən asılı olmayaraq, bütün tip məktəblərdə tətbiq edilməlidir” (Ə.Ağayev). Bilikli, savadlı cəmiyyətdə xoşagəlməz hallara yol verilməməlidir.

Şagirdlərimiz vətənpərvərlik ruhunda tərbiyə olunmalıdır, başqa sözlə şagirdlərimizi elə tərbiyə etməliyik ki, Vətənə bağlı olsunlar, Vətəni sevsinlər və müstəqilliyi hər şeydən üstün bir dəyər kimi qəbul etsinlər. Eyni zamanda, bizim gənc nəslimiz vətənpərvər olmalıdır, milli ruhda böyüməlidir. Bu dəyərlər hər bir Azərbaycan vətəndaşı üçün hər şeydən üstün olmalıdır. Elə etməliyik ki, gələcək nəsil də bu istiqamətdə inkişaf etsin. Ona görə, vətənpərvərlik, Vətənə olan bağlılıq, milli-mənəvi dəyərlər məktəblərdə mütləq geniş vüsət almalıdır, müəllimlər də bu istiqamətdə daha fəal iş aparmalıdırlar.

Şagirdlərimiz milli ruhda tərbiyə almalıdır. Milli ruhda tərbiyə biliklə, savadla eyni əhəmiyyətə malik məsələdir. Biz müəllimlər çalışmalıyıq ki, şagirdlərimiz, uşaqlarımız milli ruhda tərbiyə alsınlar, milli-mənəvi dəyərlərimizi dərindən öyrənsinlər və təbliğ etsinlər. Bizim dəyərlərimiz – milli-mənəvi dəyərlər,

mənəviyyat, vətənpərvərlik, ləyaqət, milli qürur və digərlərdən ibarətdir. Bəzi xarici qüvvələr bu dəyərlərimizi sarsıtmaq, bizi öz köklərimizdən ayırmaq istəyirlər. Bizim ən ümdə vəzifəmiz şagirdlərimizə - milli mənliyimizi, dilimizi, dinimizi, adət-ənənələrimizi qorumaq, təbliğ etmək və inkişaf etdirmək kimi dəyərləri aşılamaq olmalıdır.

Şagirdlərimizi yad təsirlərdən, bizə xas olmayan dırnaqarası dəyərlərdən qorumalıyıq. Bu gün biz informasiya əsrində, internet dövründə yaşayırıq. Azərbaycanda internet istifadəçilərinin sayı 75 faizə qalxıb. Balaca uşaqlar da internetdən yaxşı istifadə edirlər. Bütün informasiyalar da göz qabağındadır. Məlum olur ki, Avropada və digər ölkələrdə sözdə tolerantlıq, multikulturalizm, xeyirxahlıq, mərhəmət deyilsə də, əslində dini, milli zəmində ədavət, ayrıseçkilik, diskriminasiya, ksenofobiya, islamofobiya, faşizm, irqçilik və sair mürtəce dəyərlər təbliğ olunur. Bizim işimiz şagirdlərimizi bu mürtəce dəyərlərdən qorumaqdır.

Məktəbimizdə qeyd olunan dəyərlərin şagirdlərimizdə yetişdirilməsi, təhsilalanın şəxsiyyət kimi formalaşdırılması, onun təlim - tərbiyə prosesinin bərabərhüquqlu subyektinə çevrilməsi, təhsilin keyfiyyətinin yüksəldilməsi məqsədilə vaxtaşırı müxtəlif tədbirlər, o cümlədən şagird nailiyyətlərinin izlənilməsi mexanizmlərinin pedaqoji prosesə tətbiqi, şagird nailiyyətlərinin qiymətləndirilməsi, müəllimlərin akademik və metodik bilik, bacarıqlarının artırılması, müəllim – şagird, müəllim –valideyn münasibətlərinin tənzimlənməsi istiqamətində işlər, müxtəlif fənlərdən və məntiqdən müsabiqələr keçirilmişdir. Məktəbdə, həmçinin şagirdlərdə vətənpərvərlik tərbiyəsi, milli-mənəvi dəyərlərimizin təbliği və şagirdləri yad təsirlərdən qorumaq məqsədilə müxtəlif sinifdənxaric və məktəbdənkənar tədbirlər keçirilmişdir.

***Rəyçi**: dos. B.Həsənli*

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, № 5.

2. Ümumtəhsil pilləsinin dövlət standartları və proqramları. Kurikulum, 2010, №3.

3. Abbasov Ə. Kurikulum islahatlarının əsas istiqamətləri. //Azərbaycan məktəbi, 2011, №4.

4. Əhmədov A. Ümumi təhsil sistemində kurikulum islahatı: real nəticələrə doğru. // Kurikulum, 2008, №1.

**Т.Гардашов**

**Образовательные ценности**

**Резюме**

В статье ставится задача о ценностях образования. Автор касается такой важной задачи, как качества педагога. Рассматриваются вопросы воспитания у учащихся высокой образованности, в духе патриотизма, защищенности от чужеродных влияний.

**T.Gardashov**

**Values in education**

**Summary**

The article is dedicated to the issues of values. The author analyses the questions of teacher’s quality, students’ knowledge and patriotic education and protection of students from external influences.



# İNNOVASİYA HƏLLƏRİ: İSTİNAD OLUNMUŞ TƏCRÜBƏ PRİZMASINDA

**Cəsarət Valehov,**
***filologiya üzrə fəlsəfə doktoru, dosent***

İnnovasiya hələri ali təhsil, tətbiqi tədqiqat və sənaye-universitet əməkdalığının keyfiyyət və məqsədəuyğunluğunu artırmaq üçün zəruri vasitədir. Dövrün iqtisadi reallığı fərqli dəyər yaratma miqyasını və yeni innovasiya həllərini tələb edir. Qeyd olunan tələb strateji məqsəd və innovasiya arasındakı sinerjini yaradır. Bilik iqtisadiyyatı quran ölkələr hansı qitədə yerləşməsindən asılı olmayaraq, iki mühüm missiyanın öhdəsindən gələ biliblər - onlar bilik inkişafı indeksi prinsipləri əsasında geniş miqyaslı strategiyanı daim diqqətdə saxlayıblar. Bu araşdırmada bilik əsaslı iqtisadiyyatın yaradılmasında innovasiyanın tətbiq imkanlarından bəhs edilir.

***Açar sözlər:*** *innovasiya fəaliyyəti, milli innovasiya konsepti, bilik əsaslı iqtisadiyyat, tədqiqat və inkişaf, insan kapitalı.*

***Ключевые слова:*** *инновационная деятельнось, концепция национальных инноваций, экономика знаний, исследование и развитие, человеческий капитал.*

***Key words:*** *innovative activity, national innovation concept, knowledge economy, research and development, human capital.*

İnnovasiya müxtəlif araşdırmaçılar tərəfindən fərqli yönləri ilə araşdırılan fenomendir. Məsələn, məşhur təhsilşünas Drakerə görə innovasiya sahibkarlığın açarıdır. Porter, innovasiyanın rəqabət üstünlüyünü təmin edərək həm çağdaş texnologiyaların, həm də yaradıcı təfəkkürün yeni yollarının ehtiva olunduğunu ifadə etmişdir. Digər tədqiqatçı Rogers innovasiyanı fərdlər tərəfindən yeni olaraq qəbul edilən fikir, təcrübə və ya obyekt formasında təsnif etmişdir. Trott innovasiyanı texnoloji inkişaf, yeni və ya təkmilləşdirilmiş bir məhsulun və ya istehsal prossesinin, avadanlığın istehsalı, marketinq müddətində ifadə olunan bütün fəaliyyətin məcmusu şəklində qiymətləndirmişdir.Innovasiya fəaliyyətini müvəffəqiyyətlə icra edə bilmək üçünəvvəlcə innovasiyanı təşviq edən korporativ mədəniyyətə sahib olmaqlazımdır. İnnovasiyalı bir mədəniyyətə sahib olan müəssisələrin R&D quruluşunun güclü olması da olduqca əhəmiyyətlidir.

İnnovasiya-innovasiyalı fəaliyyətin effektidir. Bu fikri irəli sürən professor Kamran İmanov yenilik və innovasiyanın müqayisəli ömür dövriyyəsini aşağıdakı infoqrafikada belə təsvir edir:[3, 6]

*Şəkil 1.*




Bu şəkildən də göründüyü kimi, innovasiya anlayışı hərfi mənada yenilik olsa da, ancaq yenilikdən fərqli olaraq əlavə dəyər yaradır və beləliklə, biliyin iqtisadi və milli faydaya çevrilməsi olaraq ifadə olunur.

İnnovasiya ölkələrin inkişaf modellərini dəyişir. Məsələn, İƏİT (İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı) ölkələrində investisiya və inkişaf daha çox şəbəkə informasiyası (proqram təminatı və məlumat bazaları), innovativ əmlak (patentlər, müəllif hüquqları, dizayn və əmtəə nişanları) və iqtisadi səriştələr (o cümlədən, marka dəyəri, firma üçün spesifik insan kapitalı, bilik və bacarıqlar) kimi biliklərə əsaslanan kapitalla idarə edilir. Finlandiya, İsveçrə, ABŞ, Yaponiya, İsrail, Almaniya kimi bir çox inkişaf etmiş ölkələrdə qeyri-maddi vəsaitlərə qoyulan sərmayələr fiziki kapitala qoyulan sərmayədən çoxdur. Aşağıdakı qrafik təsvirdən də göründüyü kimi, Qlobal Rəqabətlilik İndeksi üzrə ölkələrin innovasiya reytinqi bu deyilənlərə uyğundur [7].


*Şəkil 2.*




**Qeyd.** *Araşdırma 113 göstərici-parametr, 12 sütun-göstəriciləri üzrə aparılıb.*

Effektiv innovasiya və insan kapitalının inkişafını təşviq etməklə gerçəkləşən bilik əsaslı iqtisadiyyat (bundan sonra- BƏİ) tərəqqini qoruyub saxlamaq və hətta onu sürətləndirməkdə mühüm bir platformadır. Təcrübə göstərir ki, inkişaf etmiş və etməkdə olan ölkələr bilik əsaslı iqtisadiyyatdan dayanıqlı inkişaf və innovasiya platforması kimi istifadə edirlər ki, bununla da qlobal rəqabət qabiliyyətinin gələcək mənzərəsi bəlli miqyasda dəyişə bilər. Bu kontekstdə bilik əsaslı iqtisadiyyatın ölkələrin ÜDM-dəki payına nəzər yetirək [4].

*Şəkil 3.*




**Kreativ iqtisadiyyatın ölkələrin ÜDM-dəki payı, %** (*mənbə: ÜƏMT*) (ilk 10-luq)

- Araşdırma göstərir ki, kreativ iqtisadiyyatın ÜDM-dəki payı 11,1% (*ABŞ*), 1,58% (*Bruney*) qədər dəyişməkdədir, özü də 30 ölkə üzrə 5,42% orta qiymətlə.
- Orta qiyməti 5,42%-dən çox olan göstəricini güclü iqtisadi inkişafı keçmiş ölkələr nümayiş edir.

Buradan da göründüyü kimi, innovasiya bilik əsaslı iqtisadiyyatın əsas zəmini olmaqla yanaşı, eyni zamanda sonrakı mərhələdə həm də onun məhsulu kimi iştirak edir. Bu qarşılıqlı əlaqələnmə dəyəryaratma funksiyasını daşıyır. Bu tandemdə Sinqapur təcrübəsinə müraciət etmək maraqlıdır.

Hazırda dünyanın iqtisadi güc mərkəzlərindən biri olan Sinqapur davamlı tədbirlər nəticəsində tranzit yük məntəqəsindən bilik əsaslı iqtisadiyyat modelinə transfer olunub. Ölkənin inkişaf prosesi müddət baxımından hər biri 10 il olmaqla bir sıra iqtisadi transformasiyalardan keçib: 1960-cı illərdə əməyə əsaslanan inkişaf, 1970-ci illərdə bacarıqlara əsaslanan inkişaf, 1980-ci illərdə investisiyaya əsaslanan inkişaf, 1990-cı illərdə texnologiyaya əsaslanan inkişaf və nəhayət 2000-ci ildən etibarən bilik və innovasiya iqtisadiyyatına əsaslanan inkişaf. Sinqapurun tədqiqat və inkişaf (Tİ) üzrə xərcləri ilk illərdə ÜDM-nin 0.5%-ni təşkil edirdi və müntəzəm şəkildə artaraq ÜDM-nin 2.3%-ni əhatə etmişdir. Ölkə bu göstəricini getdikcə ÜDM-nin 3.5%-nə çatdırıb. İnnovasiya göstəricilərinə görə dünya ölkələri arasında ilk 10-da qərarlaşan Sinqapur elm və texnologiya ilə vəhdətdə olan təhsil mühitini müntəzəm şəkildə inkişaf etdirmişdir. Ölkədə tədqiqat aparan elm adamları və mühəndislərin sayı 1990-cı ildə hər 10.000 nəfər üzrə 28.2%-dən, 2001-ci ildə 87.9%-ə qədər artıb [6].

Bilik əsaslı iqtisadiyyat prosesinin gücləndirilməsi məqsədi ilə Sinqapurda reallaşdırılan müxtəlif tədbirlər və təşəbbüslər aşağıdakı infoqrafikada verilir.

***Şəkil 4.***




Mənbə: Elm, Texnologiya və Tədqiqat Agentliyi, 2011. Elm, Texnologiya və Müəssisə Planı 2015, Sinqapur İqtisadi İnkişaf Şurası, Haer Analytics və İqtisadi Araşdırma Qrupu, AİB-in məlumatları və təhlilləri ilə birlikdə [11].

İnfoqrafikadan da göründüyü kimi, Sinqapurda təhsildə milli innovasiya konsepti və iqtisadi sektor qarşılıqlı təmasdadır və ölkənin inkişafı məqsədlərinə xidmət edir. Bütün bunlar inkişafın innovasiya mərhələsinə qədəm qoymaq üçün yaxşı tarixi təcrübədir. Bu təcrübənin əsas dayaq nöqtələri isə universitetlərdir. Azərbaycanın milli iqtisadiyyat perspektivi üzrə strateji yol xəritəsində universitetlərin üzərinə qoyulan missiya bunun təsdiqidir: “Universitet klasterlərinin yaradılması “təhsil–tədqiqat–innovasiya” zəncirinin effektivliyini artıra bilər. Bu baxımdan, ölkədə, ilk növbədə, bəzi ixtisaslaşmış universitetlərdə klasterlərin yaradılması təşviq ediləcəkdir. Ali təhsil sisteminin keyfiyyətinin yüksəldilməsi nəticəsində daha keyfiyyətli insan kapitalı və intellektual potensial formalaşacaq, əmək

***2**

məhsuldarlığı artacaqdır” [1].

Bilik əsaslı iqtisadiyyatlar məhsuldarlığın artımına əsaslanan inkişafa keçiddə çox mühüm faktordur. Belə bir narahatlıq vardır ki, aşağı gəlirlərdən orta gəlirlərə sürətlə keçən inkişaf etməkdə olan ölkələr dəyər zəncirinə çatana qədər orta gəlir tələsinə düşəcək [5].

Orta gəlir tələsi dedikdə - hər hansı bir iqtisadiyyatın adambaşına düşən gəlir göstəricisinin müəyyən bir səviyyəsinə çatdıqdan sonra həmin səviyyəni aşa bilməməsi vəziyyəti başa düşülür. Başqa sözlə, orta gəlir tələsi hər hansı bir iqtisadiyyatın adambaşına düşən gəlir səviyyəsinin müəyyən bir həddini keçə bilməməsi halı və ya müəyyən bir gəlir səviyyəsinə çatdıqdan sonra durğunluq vəziyyətinə düşməsi halını ifadə edir [2].

Düşünülmüş bilik əsaslı iqtisadiyyat yanaşması inkişaf etməkdə olan ölkələrə sürətli texnoloji dəyişikliklərlə ayaqlaşmaq üçün öz potensiallarını artırmağa imkan verir: məsələn, kənd təsərrüfatı istehsalını sürətləndirmək üçün biotexnologiyanın tətbiqi və yaxud İT-dən istifadə etməklə ən zəruri ixracat dəyərinin genişləndirilməsi və sair. Bu platformanın innovasiya ilə bağlılığında vacib həlqə odur ki, o, dəyər yaratma yollarını ayırd etməyi hədəfləyir. Burada bir məqama diqqət yetirmək lazımdır ki, uzun illər innovasiya R&D fəaliyyətinin bir nəticəsi olaraq təsnif edilir və xətti bir zəncirdə gerçəkləşdiyi düşünülürdü. Bu yanaşmaya görə, innovasiyanı ya elm, ya da bazardan gələn tələb formalaşdırır. Bu zəncirin həlqələri aşağıdakı kimi düzülürdü: İlkin tətbiqi araşdırma, təcrübi inkişaf, bazarlama və realizə. Və xətti innovasiya təsnifatına görə, məhsulun bazara çıxarılması ilə innovasiya fəaliyyəti yekunlaşır. Ancaq innovasiya bu cür bəsit proses deyil, hər həlqəsində qarşılıqlı təsirin olduğu bir mühitdə gerçəkləşir. Hər bir həlqə özündən öncə gələnə sıx bağlıdır və dəyişən tələblər dinamik bir prosesin varlığı üçün lazımdır. Buna görə də, xətti innovasiya öz yerini sistemli innovasiyaya verir. İnnovasiya vahid bir fəaliyyətdir və hər bir ölkə üçün davamlı inkişaf, milli rifah və artan məşğulluq anlamına gəldiyinə görə səmərəli sistemin qurulmasını tələb edir. Bir ölkənin qlobal innovasiya sisteminin parçası olması, həmin ölkənin qlobal ölçüdə rəqabət gücü qazanmasının ön şərtidir. Ölkələr artıq innovasiya siyasətlərini “üçüncü nəsil innovasiya siyasəti” olaraq adlandırırlar [10].

Bilik əsaslı iqtisadiyyat məfhumu çox vaxt qabaqcıl sənayeləşmə və məqsədyönlü xidmət sektoruna malik orta və yüksək gəlirli ölkələrlə əlaqədar olsa da, İKT-nin tətbiqi, yüksək bacarıq səviyyəsi, təhsil və innovasiya, həmçinin aşağı gəlirli ölkələrə də yüksək məhsuldarlıq və səmərəlilik gətirə bilər (və potensial olaraq buna keçid edə bilər). Yeni texnologiya və innovasiya üzrə son qlobal və regional tendensiyalar göstərir ki, bu istiqamətdə irəliyə doğru addımlamağın inkişaf etməkdə olan ölkələr üçün xətti bir proses olmasına ehtiyac yoxdur. Bilik əsaslı iqtisadiyyatlar xətti inkişaf modelini əldə etməyə yardım edə və daha sürətlə inkişaf etmək üçün imkanları təmin edə bilər.

Tədqiqat və inkişafa (Tİ) əsaslanan innovasiyalardan başqa, biznes innovasiyaları da geniş yayılmışdır, məsələn, aşağı gəlirli bazarlara xidmət göstərmək üçün “jugaad” innovasiya [8]. Ucqar ərazilərdə yaşayan geniş əhali kütləsinin ehtiyacları üçün nəzərdə tutulan məhsul və xidmətləri təmin edən, elektrik enerjisinə əsaslanmayan

günəş enerjisi bazarının meydana gəlməsi buna misal ola bilər.

İnkişaf etməkdə olan bir çox ölkələr Dünya Bankının bilik iqtisadiyyatı indeksi (BİI) üzrə müxtəlif iqtisadi, sosial və infrastruktur göstəricilərinə dair orta səviyyədən aşağı mövqedə dayanır. Bütün BİI göstəriciləri üzrə yüksək ballar bilik əsaslı iqtisadiyyatın(BƏİ) yaradılması üçün mütləq şərt deyil, lakin bazar iqtisadiyyatına keçid edən ölkələr, eləcə də Azərbaycan xüsusilə də İKT infrastrukturunu genişləndirməklə və təhsil sahəsinə sərmayə qoyuluşlarını artırmaqla öz imkanlarını yaxşılaşdırmaq üçün daha çox iş görməlidir. Aşağıda təqdim olunan "Qlobal rəqabətlilik indeksi"nin 2015-2016-cı illər üzrə reytinqində Azərbaycanın innovasiya parametri üzrə göstəriciləri əks olunub [4].

*Şəkil 5.*




Ölkələrin BƏİ potensialını qiymətləndirərkən Dünya Bankı tərəfindən hazırlanmış moduldan – yuxarıda adı çəkilən BİI-dən istifadə etməklə hər bir ölkənin texnologiya, təhsil vasitələrini və aidiyyəti yanaşmalarını nəzərdən keçirə bilərik.

İqtisadi stimul və institusional rejim, təhsil və bacarıqlar, innovasiya və texnologiyanın mənimsənilməsi, İKT infrastrukturu kimi dörd prinsip üzrə alt indekslər BİI-ə daxildir.

| Prinsip | Əsaslandırma | Göstəricilər |
|---|---|---|
| **Iqtisadi stimul və institusional rejim** | **Iqtisadi stimul və institusional rejim yeni və mövcud biliklərdən səmərəli istifadəni, həmçinin sahibkarlığın inkişafını stimullaşdırır.** | **Tarif və qeyri-tarif maneələri Qanunvericiliyin keyfiyyəti Hüquqi norma** |
| **Əhalinin təhsil və bacarıqları** | **Təhsilli və bacarıqlı insanlar biliyi yaradır, paylaşır və məqsədyönlü istifadə edir.** | **• Böyüklərin oxuma-yazma səviyyəsi • Orta təhsil alanların ümumi sayı • Ali təhsil alanların ümumi sayı** |
| **Innovasiya və texnologiyanın mənimsənilməsi sistemi** | **Firmalar, tədqiqat mərkəzləri, universitetlər, məsləhətçilər və digər təşkilatlardan ibarət səmərəli innovasiya sistemi inkişaf edən qlobal bilik ehtiyatından istifadə edir, onu mənimsəyir və yerli ehtiyaclara uyğunlaşdırır, yeni texnologiya yaradır.** | **• Royalti ödənişləri və daxilolmaları (adam başına $) • Milyon insana düşən elmi jurnal məqalələri • Milyon adam üzrə Birləşmiş Ştatların Patent və Əmtəə Nişanı Ofisi tərəfindən yerli əhaliyə verilən patentlər** |
| **İnformasiya və kommunikasiya texnologiyası infrastrukturu** | **Informasiya və kommunikasiya texnologiyası informasiyanın effektiv formada yaradılmasını, yayılmasını və emalını sadələşdirir.** | **• 1,000 insana düşən telefon • 1,000 insana düşən kompüter • 1,000 insana düşən internet istifadəçisi** |

Dünya Bankı Bilik İqtisadiyyatı İndeksini (BİI) – dörd prinsipə əsaslanan bilik iqtisadiyyat göstəricisini hazırlamışdır və ölkələrin iqtisadiyyatını müqayisə etmək üçün həmin indeksdən istifadə edir [9].

İntuitiv olaraq, BİI göstəriciləri yüksək olan ölkələr sürətli iqtisadi inkişaf səviyyələrinə malikdir. Yüksək BİI göstəriciləri həmçinin gələcək iqtisadi artım üzrə yüksək göstəricilərlə əlaqədardır. Aydındır ki, daha qabaqcıl ölkələr BƏİ qədər güclüdür. Hansının digərini təşviq etməsindən asılı olmayaraq, bəllidir ki, qabaqcıl ölkələrdə BİI prinsiplərinin əksəriyyəti vardır və onların dəstəklədiyi BƏİ iqtisadi inkişafında zəruri rol oynayır.

Nəticə kimi qeyd etmək lazımdır ki, qabaqcıl ölkələrin təcrübəsinə əsaslanaraq, inkişaf etməkdə olan ölkələrin həll etməli olduğu bir sıra məsələlər vardır: Tİ potensialının formalaşdırılmasına sistemli və davamlı sərmayələrin qoyulması və strategiyaların hazırlanması; biliyə əsaslanan başlıca sektorların rəqabət qabiliyyətini artırmaq üçün lazım olan səriştəni təmin edən təhsil sistemlərinin təkmilləşdirilməsi və insan kapitalı ehtiyatının yaradılmasına sərmayələrin qoyulması; dinamik özəl sektorun sərmayələrini cəlb etməyə yardım edən iqtisadi, institusional islahatların həyata keçirilməsi.

Ölkənin sənaye sahələri və müəssisələrinin inkişaf prosesində oynaya biləcəyi mümkün rolların müəyyənləşdirilməsi üçün texnologiyanın müxtəlif sahələrində yeni inkişaf tədbirlərinin izlənilməsi və qavranılmasına diqqət yönəldilməlidir. Texnologiyaya əsaslanan həll yolları təkcə mal və xidmətlərin istehsalı və çatdırılması üçün effektiv üsul kimi nəzərdən keçirilməməlidir, həmçinin inklüziv artım və dayanıqlı inkişaf kimi sosial ehtiyaclara cavab kimi baxılmalıdır.

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasının milli iqtisadiyyat perspektivi üzrə Strateji Yol Xəritəsi/http://azertag.az/store/files/news/STRATEJI%20YOL%20XERITESI.pdf.

2. Bağırzadə E. İnkişaf iqtisadiyyatinin yeni tədqiqat problemi: orta gəlir tələsi/http://unec.edu.az/iqinkisaf-iqtisadiyyatinin-yeni-tedqiqat-problemi-orta-gelir-telesitisadiyyatinin-y/.

3. İmanov K. Azərbaycan Respublikasının universitetlərində əqli mülkiyyətin və elmi-tədqiqat fəaliyyətinin dəstəklənməsində Müəllif Hüquqları Agentliyinin rolu (innovasiyalalı inkişaf və universitetlərdə (elmi müəssisələrdə) texnologiyaların kommersiyalaşması yolları, Bakı 2016.

4. İmanov K. Kreativ iqtisadiyyat və Azərbaycan iqtisadiyyatının inkişafı, Bakı 2016.

5. Eichengreen B. Escaping the Middle-Income Trap/ https://www.kansascityfed.org/publicat/sympos/2011/Eichengreen_final.pdf.

6. Global Urban Development, Singapore Metropolitan Economic Strategy Report, Singapore's Economic Transformation /http://www.globalur-bandevelopment.org/GUD%20Singapore%20MES%20Report.pdf.

7. http://www3.weforum.org/docs/gcr/2015-2016/Global_Competitivene-ss_Report_2015-2016.pdf

8. Jugaad Innovation: Think Frugal, Be

Flexible, Generate Breakthrough Growth Hardcover –2012by Navi Radjou , Jaideep Prabhu , Simone Ahuja.

9. ‘Producing’ Knowledge Economies: The World Bank, the KAM, Education and velopment/https://susanleerobertson.files.wordpress.com/2009/-10/2008-simons-kam.pdf.

10. See, Lange, A. et al. (2010), “Next-Generation Clusters: Creating Innovation Hubs To Boost Economic Growth,” Cisco White Paper, at http://www.cisco.com/web/about/ac79/docs/ pov/Clusters_ Innovation_ Hubs_-FINAL.pdf.

11. When Fast Growing Economies Slow Down: International Evidence and Implications for the People’s Republic of China /https://www.adb.-org/sites/default/files/publication/28913/economics-wp262.pdf.

**Дж.Валехов**

**Инновационные решения: сквозь призму ссылаемого опыта**

**Резюме**

Инновационные решения являются необходимым средством для повышения качества и целесообразности высшего образования, прикладных исследований, а также промышленно-университетского сотрудничества. Современные экономические реалии требуют иного масштаба создания ценностей и инновационных решений. Это требование создает синергию между стратегической целью и инновацией. Страны, создавшие экономику знаний, смогли выполнить две важные миссии, независимо от того, на каком континенте они находятся - широкомасштабная стратегия на основе принципов индекса развития знаний всегда была в центре их внимания. В работе повествуется о возможностях применения инноваций в создании экономики знаний.

**J.Valehov**

**Innovative solutions: through the prism of referred experience**

**Summary**

Innovative solutions are a necessary means for increasing quality and rationality of higher education, applied research and industry-university cooperation. Modern economic realities demand different scale of value creation and innovative solutions. This demand creates synergy between the strategic goal and innovation. Irrespective of which continent they are located on, countries that built knowledge economy managed to fulfill two important missions – a large-scale strategy based on knowledge development index principles has always been the focus of their attention. This article highlights opportunities for applying innovations in building knowledge economy.

# TƏHSİLİN MODELLƏŞDİRİLMƏSİNƏ DAİR



**Tofiq Məmmədov,**
***fəlsəfə doktoru,***
***Naxçıvan Müəllimlər İnstitutunun dosenti***

**Ayxan Hüseynli,**
***Naxçıvan Müəllimlər İnstitutunun magistrantı***



Müəllim zülməti yaran nur, cəhaləti elmin qılıncı ilə yox edən, elmi üstün olan, qəlbi ilə insanlara yaxınlaşan, böyük örnək, insanlara elm öyrətməklə həyatını şam kimi əridən, qəlblərdə əbədi həyat quran şəxsiyyətdir.

***Heydər Əliyev***

***Açar sözlər:*** *informasiya, innovasiya, təlim texnologiyası, təlimin modelləşdirilməsi, elektron tədris resursları.*

***Ключевые слова:*** *информация, инновация, технология, моделизации обучения, электронный урок ресурсы.*

***Key words:*** *information, innovation, training technology, training modelling, electronic teaching resources.*

Çağdaş Azərbaycanın inkişafının təməlini demokratiya, azadlıq, tolerantlıq (bir çox ölkələr üçün Azərbaycanın nümunəsi), dinamik iqtisadi inkişaf və bloklara qoşulmamaq kimi prinsiplər təşkil edir.

XXI əsrin əvvəllərində həyatın bütün sahələrində olduğu kimi, Azərbaycan təhsilində də əsaslı müsbət dəyişikliklər baş vermişdir: Təhsil haqqında Azərbaycan Respublikasının Qanununun qəbul edilməsi, təhsil islahatlarının keçirilməsi, milli dəyərləri saxlamaqla dünyanın inkişaf etmiş ölkələrinin təhsil sisteminə inteqrasiya, Boloniya Konvensiyasına qoşulma, ilk dəfə olaraq təhsildə kredit sisteminin tətbiqi, “hafizə”, “yaddaş” məktəbindən “təfəkkür” məktəb modelinə keçidin əsasını təşkil edən yeni fənn proqramlarının (kurikulumların) təhsilə tətbiqi, “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın qəbul edilməsi (2013-cü il 24 oktyabr dövlət proqramı) və s.

Bu dəyişikliklərə informasiya texnologiyalarının sürətli inkişafını, böyük həcmli informasiyaların toplanması, informasiya cəmiyyətinə keçid, təhsilin bütün pillələrində onun səmərəliliyini təmin edən, təhsilin keyfiyyətinə yüksək dərəcədə müsbət təsir edən İKT-dən istifadə kimi resursları da əlavə etmək olar.

XXI əsrin əvvəllərindən başlayaraq təhsil sisteminin bütün sahələrində əsaslı dəyişikliklər edilməsi zərurəti yaranmışdır. Əgər keçən əsrdə şagirdlərə I sinifdə oxumaq, yazmaq və hesab əməlləri öyrədilirdisə, indi bu bacarıqlar məktəbəqədər təhsil müəssisələrində praktik məzmunlu biliklər şəklində formalaşır. Müasir dövrün şagirdin internet vasitəsilə özü üçün maraqlı olan istənilən mövzu üzrə axtarış aparmaq və onu mənimsəmək bir o qədər də çətinlik törətmədiyindən, onları təəccübləndirmək, diqqətini

təlim prosesində daim nəzarətdə saxlamaq o qədər də asan deyildir. Bunun üçün müasir dövrün müəllimindən bir sıra yeni keyfiyyətlər tələb olunur.

Bəs təlim prosesini necə təşkil etmək lazımdır ki, müasir dövrün tələblərinə cavab verəcək yeni nəsil yetişdirmək mümkün olsun?

İnkişaf etmiş ölkələrin təhsil sistemində qazandıqları uğurları nəzərdən keçirdikdə məlum olur ki, onlar nəzəri biliklərə nisbətən, praktik biliklərə daha çox üstünlük verməyi məqsədəuyğun hesab edirlər.

Beynəlxalq Müəllimlər İttifaqı XXI əsrin əvvəlində təlimin keyfiyyətini, effektivliyini və səmərəliliyini artırmaq məqsədi ilə yeni təlim modeli təklif etmişdir:

1. Təlim probleminin həlledici qüvvəsi olmaq.
2. Təlim prosesində bilikləri sistemləşdirmək bacarıqlarını inkişaf etdirmək.
3. Təlimdə problemi yaradan səbəbləri araşdırmaq və onu aradan qaldırmaq yollarını müəyyən etmək.
4. Problemi həll etmə bacarıqlarını inkişaf etdirməklə yanaşı özünəgüvən prinsipini təkmilləşdirmək.

Bu modelə uyğun gələ bilən müəllim öncə “özünü qiymətləndirmə” testlərindən keçməlidir.

Müəllimin “özünü qiymətləndirmə”sini, əsasən, aşağıdakı kimi təsəvvür etmək olar:

- Bir müəllim kimi mən müasir dövrdə nəyə nail olmağa ümid edə bilərəm?
- Müasir dövrün tələblərinə cavab verən şagirdləri öyrətmək üçün özümü nə dərəcədə hazırlıqlı hesab edirəm?
- Bir pedaqoq kimi şagirdlərimin kamil yetişməsi üçün nə etməliyəm?
- İxtisasımı zamanın tələbinə uyğun yaxşı bilirəmmi?
- Tədris etdiyim fənnə aid yeni metodlardan və müasir təlim texnologiyalarından necə istifadə edirəm?
- Müasir təlim texnologiyalarından istifadə etməsə idim, rəqabətədavamlı, informasiya axınından baş çıxara biləcək, zamanın tələbinə cavab verə bilən vətəndaş formalaşdırmağını mümkün olardımı?
- Müəllim olaraq hansı son innovativ texnologiyaları öyrənib tədris prosesində tətbiq etmişəm? və s.

Bu deyilənlərlə yanaşı, eyni zamanda müəllim öz fəaliyyətini dəyərləndirməklə ona tənqidi yanaşmağı, müasir təlim metodlarından və texnologiyalarından istifadə etməyi özünün gündəlik fəaliyyət proqramı hesab etməlidir. Müasir texnologiyalardan səmərəli istifadə bacarıqlarına malik olmayan müəllimin təlimdə müvəffəqiyyət qazanması qeyri-mümkündür.

İngilis yazıçısı David Dryu yazırdı: Bizim müəllim kimi iki seçimimiz vardır.

1. Nəzəriyyə çox çətindir, informasiyanı şagirdlərin yalnız bir qismi mənimsəyib tətbiq sahəsində düzgün istifadə edə bilər.
2. Nəzəri olaraq hər kəs informasiyanı mənimsəyə bilər, əsas olan onu elə təqdim etməkdir ki, mənimsəmə prosesi şagirdlər üçün sadələşsin, zamanın itkisi aradan qaldırılsın, tətbiq sahəsində daha effektiv nəticə əldə edilsin.

İ.Kant deyirdi: “Fikri yox, fikirləşməyi öyrət”.

A.Eynşteyn deyirdi: “Kim təlimi maraqlı edə bilirsə, o, öyrətməyi bacarır”.

Təlimdə müvəffəqiyyətin əldə edilməsinə müəllimin düşüncə tərzi, elmi-metodik hazırlığı, nitqi və davranışı ilə yanaşı, şagirdlərin bilik, bacarıqları və potensial imkanlarının üzə çıxarılmasının da böyük təsiri vardır.

Təlim çoxşaxəli mürəkkəb bir prosesdir. Təlimdə uğurlu nəticə almaq üçün şagirdlərin fərdi xüsusiyyətlərini, yaş səviyyələrini, psixoloji vəziyyətini, yaddaşı-

nı, təffəkürünü, görmə qabiliyyətini, iradəsini və s. amilləri nəzərə almaq çox vacibdir. Eyni sinifdə şagirdlərin bilik səviyyələri arasında fərqlərin olduğunu müəyyən etmək o qədər də çətin deyil. Bu fərqləri hər bir şagirdə fərdi yanaşmaqla aradan qaldırmaq mümkündür.

Müasir dövrdə informasiya-kommunikasiya texnologiyalarından (İKT) səmərəli istifadə etməklə şagirdlərin fərdi öyrədilməsinə, praktik biliklər əldə edilməsinə nail olmaq olar. Təlimdə müxtəlif mükəmməl öyrədici proqramlar sistemi vardır. Buna misal olaraq web texnologiyaları, onlayn resursları, elektron lövhə və s. istifadə etməklə təlimin fərdiləşməsini təmin etmək olur. Çoxillik təcrübələrə əsaslanaraq deyə bilərik ki, təlim prosesində İKT-dən səmərəli istifadə etdikdə ənənəvi dərslərlə müqayisədə ciddi fərqlərin yarandığının şahidi olmuşuq.

Təhsil Nazirliyi qabaqcıl müəllimlərin dərslərindən videoçəkilişlər edərək, interaktiv texnologiyaları tətbiq etməklə şagirdlər üçün videodərslər təşkil etmişdir. Əgər şagird müəyyən səbəbdən dərsdə iştirak edə bilməyibsə və ya dərsi yaxşı başa düşməyibsə, bu zaman video.edu.az saytına daxil olub müvafiq fənni seçməklə keçilən mövzunu tapıb yenidən öyrənə bilər. Videodərslərin adi dərslərdən üstünlüyü orasındadır ki, şagird keçilən dərsləri bir neçə dəfə təkrar etmək imkanına malik olur. Bu qayda ilə şagird yeni dərsi öyrənənədək videodərsləri davam etdirə bilər.

Müasir təlim texnologiyalarının bir nümunəsi Promethean interaktiv lövhələrdən istifadədir. Bu lövhələrin üstün cəhəti orasındadır ki, təlimdə artıq əlavə vasitələrdən-stikerlərdən, plakatlardan, sxemlərdən, rəngli markerlərdən, silgidən istifadə etməyə ehtiyac qalmır. Bütün bu imkanlar Activinspire proqramında nəzərdə tutulmuşdur. Bu proqram vasitəsilə şagirdlərə keçilən mövzuya aid şəkillər, səs faylları, videoçarxlar təqdim edilmişdir. Promethean proqramının bir üstün cəhəti də orasındadır ki, burada xüsusilə riyaziyyata aid lazım olan bütün alətləri-transporitri, pərgarı, xətkeşi interaktiv lövhəyə istənilən anda gətirmək olur. Bu proqramın daha bir üstün cəhəti də orasındadır ki, alətlərin, şəkillərin ölçüsünü böyütmək olur. Bu da arxada oturan və ya zəif görən şagirdlərin şəkilləri daha yaxşı görmələrinə şərait yaradır.

Müasir texnologiyalardan istifadə etməklə təlimin modelləşdirilməsi onun başqa formalarına nisbətən şagirdlərin məntiqi təfəkkürünü daha yaxşı inkişaf etdirir və zehni qabiliyyətini üzə çıxarır. Onların fənnə marağını, həvəsini artırmaqla yanaşı, həm də təlimdə fəal iştirakına şərait yaradır. Təlimin modelləşdirilməsinin əqli tərbiyəyə də təsiri böyükdür. O, şagirdlərdə şüurluluq, fəallıq, sistematiklik və ardıcıllıq kimi müsbət keyfiyyətlərin formalaşdırılması ilə yanaşı, onların müstəqil fəaliyyətinə geniş imkanlar açır.

Təlimin sxematik modeli aşağıdakı kimi təsvir edilmişdir:




Söylənilənləri ümumiləşdirərək belə nəticəyə gəlmək olar ki, İKT vasitəsilə təlimin modelləşdirilməsinə nail olduqda, ölkəmizin gələcək qurucularında müasir

dövrün tələblərinə uyğun bilik, bacarıq və vərdişlər formalaşdırmaq olar.

***Rəyçi: prof. O.Musayev***

## İstifadə edilmiş ədəbiyyat

1. Огородников И. Оптимальное усвоенин учащимсия знаний и сравнительная эффективность отдельных методов в школе. Москва: Просвищение, 1969.

2. Бабанский Ю. Система способов оптимизации обучения. Вопросы психологии. Москва, 1982, №5.

3. Тализина Н. Теория поэтапного формирования умственных действий. Москва, 1966.

4. Məmmədov T. Təhsildə İKT. Naxçıvan, 2014.

5. www/.mektebli/.president.az

6. İnternet və internet texnologiyaları.

**Т.Мамедов,**
**А.Гусейинли**

**О моделировании образования**

**Резюме**

Статья посвящена совраменной информационной технологи при моделизации обучения.

**T.Mammadov,**
**A.Huseyinli**

**About the modeling of education**

**Summary**

The article modelization information technology of education.

* * *

**Hörmətli abunəçilər!**

# MODELLƏMƏ ÜSULU VƏ ONUN TƏDRİSDƏ TƏTBİQİ



**Səbinə Ağayeva,**
***riyaziyyat üzrə fəlsəfə doktoru,***

**Elnarə Məmmədova,**
***pedaqogika üzrə fəlsəfə doktoru***



***Açar sözlər:*** *beynəlxalq qiymətləndirmə, model və yanaşmalar, riyazi savad, riyazi səriştə, elmi mühakimələr.*

***Ключевые слова:*** *международное оценивание, модели и подходы, математическая грамотность, математические навыки, научное рассуждение.*

***Key words:*** *international assesment, models and approaches, mathematical literacy, mathematical skills, scientific reasoning.*

Qloballaşan dünyada qarşıda duran vəzifələrdən biri də, hər ölkədə təhsilin keyfiyyətinin təminatı üzrə yeni sistemin yaradılmasıdır. Təsadüfi deyildir ki, son illərdə təhsilin keyfiyyətinin yüksəldilməsi məsələsi daha həssas bir mövzuya çevrilmişdir. Bu gün təhsilin keyfiyyəti cəmiyyətin inkişafı ilə bilavasitə əlaqədardır. Bütün direktiv sənədlərdə təhsildə yüksək keyfiyyətə nail olmaq başlıca məqsəd kimi götürülür. Təhsilin keyfiyyətinin yüksəldilməsi məsələsində əsas istiqamətlərdən biri məktəbdə tədris prosesində inkişafetdirici effektə nail olmaq üçün müvafiq model və yanaşmaların işlənib hazırlanması ilə bağlıdır. Həm də bu modellər onun bütöv və sistemli şəkildə inkişafını təmin etməlidir.

Müasir qloballaşan dünyada təhsildə yaranan nailiyyətə sahib olmaq üçün təkcə milli qiymətləndirmə çərçivəsində qalmaq olmaz. Doğrudan da ölkəmizdə təhsili cəmiyyətdə müəyyənləşdirmək üçün hökmən Beynəlxalq qiymətləndirmədə arzuolunan nəticələrə çatmağa ehtiyac hiss olunur. Çünki beynəlxalq qiymətləndirmənin sualları məhz model şəklində təqdim olunur. Başqa sözlə onlar bütünlüklə şagirdlərin həyatla bağlı təsəvvürlərini həm yoxlayır, həm də inkişaf etdirir. Bu isə onların gələcəkdə həyata daha çox hazır olaraq texnologiya məsələləri ilə bağlı sahələrdə yüksək faydalılığı ilə müşayiət olunur. Deməli, riyaziyyat dərslərində yeni modelləmə üsulunun tətbiqi ölkənin ümumi inkişaf səviyyəsinin yüksəlməsi ilə nəticələnə bilər. Nəhayət, təhsilə düzgün yanaşma – cəmiyyətə daha çox fayda verə biləcək kadrların yetişməsi və bununla da ölkənin ümumi inkişaf səviyyəsinin yüksəlməsi ilə nəticələnər.

Beləliklə, hər zaman elmlərin tədrisində istifadə edilən proqramların, müasir təlim yanaşmalarının və eləcə də müəllimlərin peşəkarlıq səviyyəsinin artırılması məsələləri diqqət mərkəzində saxlanılır. Ələlxüsus riyaziyyata bu sahədə daha çox diqqət yetirilir. Ölkəmizdə bəzən riyaziyyatın göstəricilərinin aşağı olması faktını aradan qaldırmaq üçün onun tədrisinə yenidən baxılmalı, şagirdlərin riyazi qavramalarının və problemi həll etmə bacarıqlarının inkişafı üçün strategiyalar formalaşdırılmalıdır. Eləcə də riyaziyyatın öyrənilməsi üçün motivasiyanın necə artırılacağına və gələcəkdə riyaziyyatla əlaqədar peşələrin seçilməsinə çox diqqət artırılmalıdır.

Riyaziyyat və texnologiyalar sahəsinə marağın çox olması ölkənin iqtisadi rəqabətlilik qabiliyyətinin yüksək olması deməkdir. Riyaziyyatın ölkənin həyatında nə qədər önəmli bir çəkiyə malik olduğunu bilərək dünya ölkələrində olduğu kimi bizdə də bu məsələlər hər zaman diqqət mərkəzindədir.

Cəmiyyətin inkişafına təkan verən aparıcı qüvvə kimi təhsil qloballaşan dünyada cəmiyyət üzvlərinin öz bilik və bacarıqlarının davamlı olaraq inkişaf etdirilməsi üçün ən başlıca açardır. Bunun uğurları isə onların təhsil səviyyəsindən, oradakı oxu, yazı, ədəbiyyat, xarici dillər, İKT sahəsindəki biliklər və sairdən də çox asılıdır. Ona görə də, son illərdə bir sıra ölkələr qiymətləndirmə və təhlillərin təhsilin inkişafı üçün strategiyaların hazırlanmasına qoşulmuşlar. Hazırda bu sahədə beynəlxalq proqramlar işlənir. Bir sıra ölkələrdə təhsilin nailiyyətləri müqayisəli şəkildə qiymətləndirilməklə əsas fənlərin tədrisində keyfiyyət dəyişikliklərinin tendensiyası müəyyənləşdirilir, fənlərin tədrisinin keyfiyyətinə təsir edən faktlar üzə çıxarır, kurikulumlar, eyni zamanda müxtəlif ölkələrin təhsil prosesinin təşkilinin əsasları haqqında məlumat toplanılır.

Bunlar hamısı dünya ölkələri təhsillərinin bir-birinə inteqrasiyası məqsədilə edilir. Burada məqsəd həm də təhsildə müxtəlifliyi üzə çıxarmaqdır. Çünki bir çox hallarda ölkələrin təhsil proqramlarının çərçivəsindən kənara çıxan, şagirdlərin alışmadığı, lakin çağdaş zamanda həyat üçün önəmli sayılan suallara, problemlərə də rast gəlinir (Riyaziyyat və tətbiqi elmlərin beynəlxalq təqdimatının əsas nəticəsi, I hissə. Moskva, 2008).

Beynəlxalq qiymətləndirmə bir neçə istiqamətdə aparılaraq yetkinlik yaşlı şagirdlərin kurikulumda nəzərdə tutulan mövzuları (riyazi savad, təbiət elmləri üzrə savad və oxu savadı) hansı səviyyədə öyrəndikləri deyil, müasir informasiya cəmiyyətində qarşılaşdıqları məsələlərin həllində əldə etdikləri bilik və bacarıqlardan istifadə edə bilmə qabiliyyətini ölçmək məqsədi daşıyır. Bu qəbildən dünya üzrə 3 cür Beynəlxalq qiymətləndirmə təşkil edilmişdir: PISA, TIMS və PIRLS.

- PISA şagirdlərin riyazi savad, təbiət elmləri savadı, oxu savadı haqda.
- şagirdlərin motivasiyası, özləri haqqındakı qənaətləri, öyrənmə metodları barədə.
- həmçinin məktəb mühiti və şagirdlərin ailələri haqqında məlumatlar toplayır.

PISA layihəsində “savad” termini – şagirdin bilik və potensialını inkişaf etdirib, cəmiyyətdə daha fəal iştirak edərək cəmiyyətə öz töhfələrini vermək üçün yazılı mənbələri tapma, onlardan istifadə etmə mənimsəmə və qiymətləndirməsi kimi ifadə edilməkdədir. Qiymətləndirmə proqramındakı ölçmələr aşağıdakı istiqamətdə aparılır: Şagirdlərin bilik və bacarıq səviyyələrini – layihədə iştirak edən digər ölkələrdəki şagirdlərin bilik və bacarıqları ilə müqayisə edilir və bunun nəticəsində təhsilin səviyyəsinin yüksəldilməsi məqsədilə yeni standartlar yaradılması nəzərdə tutulur. Bir qədər də konkretləşdirsək, bu yolla təhsil sisteminin güclü və zəif tərəfləri müəyyən edilir.

PISA gənclərin gündəlik həyatda qarşılaşa biləcəkləri çətinliklərin öhdəsindən gəlmək üçün bilik və bacarıqlardan istifadə etmə qabiliyyətlərinin ölçülməsinə istiqamətlənir.

Məsələn, PISA proqramı təbiət elmləri üzrə savadlılığa dair aşağıdakı məqsədləri hədəf götürür:

- Elmi mühakimələrin irəli sürülməsinə dəstək vermək;
- Şagirdin təbiət elmlərinin öyrənilməsində özünəinam yaratmaq;
- Şagirdin ətraf mühitə və təbii ehtiyatlara qarşı məsuliyyətini artırmaq.

Maraqlıdır ki, oxu bacarıqlarını bu

proqram fərdin öz hədəflərinə çatması, biliyini artırmaq və cəmiyyətə inteqrasiya etməsi üçün yazılı mətnləri anlamaq, istifadə etmək və ifadə etmək bacarıqları ilə əlaqələndirir.

Riyaziyyatın da yoxlanılması bu proqram çərçivəsində çox maraqlı prinsiplərlə müşayiət olunur. Bir sıra problemlərin açılması riyazi terminlərin izahı ilə bağlı olur.

• Riyazi savad - fərdin, riyaziyyatın dünyada oynadığı rolu görməsi və başa düşməsi, sağlam əsaslara yiyələnməklə uğurlara çatması, yaradıcı, həssas bir vətəndaş olaraq öz ehtiyaclarını ödəyə biləcək bir şəkildə riyaziyyatdan istifadə etməsi kompleksini aradan qaldırmağa imkan verir. Riyazi savadlılıq - riyaziyyatın daha geniş və funksional istifadəsini nəzərdə tutur və müxtəlif situasiyalarda riyazi problemləri aşkar etmək və düstur halında vermə bacarığını əhatə edir. Nəticədə oxuma bacarığı, təbiət elmləri üzrə və riyazi savadlılığa uyğun olaraq 5, 6 və 6 səviyyədə qiymətləndirilir.

Bu səviyyələr bir-birindən mürəkkəbliyinə görə fərqlənərək riyazi mühakimənin güclənməsi və həyatda rast gələn vəziyyətlərin aspektləri ilə birbaşa əlaqələndirə bilmə bacarıqları ilə müşayiət olunur. Bu zaman o, ümumiləşdirmələr aparmağı, nəticə çıxarmağı və mülahizə yürütməyi bacarmalıdır.

Beynəlxalq qiymətləndirmənin nəticəsini təhlil edərkən beynəlxalq imtahanlarda ən üst yerlərdə olan ölkələrin yüksək nailiyyət əldə etmələrinə səbəb aşağıdakı 3 məsələ ilə əlaqədar ola bilməsi fikri müəyyənləşmişdir:

- Təhsilin keyfiyyəti müəllimin keyfiyyətindən yüksək ola bilməz;
- Təlim metodlarından səmərəli istifadə mövcuddur;
- Fərdi xüsusiyyətləri və müxtəlifliyi nəzərə alaraq hər şagirdə fərdi yanaşır və hər uşağın uğur qazanması üçün çalışırlar.

Konkret olaraq Finlandiyanın PISA-dakı uğurunun səbəbləri onların öz alim və müəllimlərinin fikrinə görə bunlardır:

- Pedaqoji kadr hazırlığı;
- ənənəvi məktəb həyatı;
- müəllimlik peşəsinə münasibət;
- ixtisasartıma təhsili.

Göründüyü kimi, müəllimlər cəmiyyətin inkişafında aparıcı rol oynayır.

Bu işdə uyğun idarəetmə orqanları ailələr və cəmiyyət müəllimlərə və məktəblərə tam etibar etməlidir. Bunun üçün daim öz üzərimizdə işləməliyik. Bu gün beynəlxalq aləmdə hər bir oblastda mentorluq deyilən bir sahə fəaliyyət göstərir. Müəllimlərin içində yaxşı mentorlar yetişə bilir və məncə hər bir müəllim özünü öz daxilində illər keçdikcə özündən gənc müəllimlər üçün elə məhz mentor kimi yetişdirməyə çalışmalıdır. Haqqında danışdığımız beynəlxalq qiymətləndirmə yüksək səviyyədə nümayiş etdirmək seçimi yaxşı təhsilin qarantı sayılan hər bir şeyi, o cümlədən müəllimi yetişdirmək lazımdır.

Artıq bu baxımdan beynəlxalq aləmdə yeni pedaqoji prinsiplər formalaşıb. Əslində bu prinsipləri təcrübəli qabaqcıl müəllimlərimizin fəaliyyətində də müşahidə etmək mümkündür. Müəllimin işinin səviyyəsi təhsilin bir az təsnifata, hər zaman ehtiyac olduğunu qəbul etmək bu prinsiplərlə tanış olmağa dəyər.

Əlbəttə, hamı bu fikirlə razılaşar ki, yaxşı bir müəllim olaraq, ilk növbədə, hər bir şagirdin fərdiliyini və dəyərini bilmək, hər bir şagirdin riyaziyyatı öyrənib istifadə edə biləcəyinə inanmaq və beləliklə, şagirdlərin uğur əldə etmələri üçün onlarla, xüsusən riyaziyyatı öyrənmələri ilə bağlı bərabər və ədalətli şəkildə davranmaq çox vacibdir. Buna görə də müəllim riyaziyyatın tədrisi üzrə fikirlərini bütün şagirdlərin öyrənə biləcəklərinə inam üzərində qurur.

Proqram üzrə tədris düzgün qurulduqda artıq VIII-IX siniflər üzrə şagirdlər riyaziyyat üzrə ilk mərhələdə aydın və lazımi informasiyanın verildiyi tanış məzmunlu, sadə və köməyi verilmiş sualları cavablandırmağı bacarır, informasiyanı başa düşür, sual kitabçasındakı təlimata əsaslanaraq adi prosedurları yerinə yetirə bilirlər. Bu iş ardıcıl davam etdirildikdə şagirdlər birbaşa nəticə çıxarmağı tələb edən misal və məsələləri yerinə yetirir, mənbədən uyğun gələn məlumatı əldə etməyə çalışır, məsələnin həlli üçün bir üsuldan, əsas alqoritmlərdən, forma və üsullardan istifadə etməyi, adi nəticənin əldə olunması yollarını dərk edə bilir. Bu yola alışdırılmış şagirdlər sadə problemin həlli strategiyalarını seçərək tətbiqetməni, müxtəlif məlumat mənbələrinə əsaslanmış nümunələrdən istifadə etməyi və onların üzərində işləməyi bacarır, hətta yeri gəldikcə şərh, düşüncə və nəticələrini ifadə edən fikirlər də yürüdə bilirlər, sonra öz fikirlərini ifadə etməyə hazır olurlar. Beləliklə, şagirdlər mürəkkəb situasiyalarda müəyyən modellərlə işləməyi, müqayisə etməyi və dəyərləndirməyi, öz geniş bilik dairələrindən, qabiliyyətlərindən istifadə etməyi, mürəkkəb problemin həlli strategiyalarını seçməyi bacarırlar.

Şagirdlər mürəkkəb riyazi məsələlərin həllində öz biliklərinə və tədqiqatlarına əsaslanaraq məlumatı dərk edir, nəticə çıxarmağı, müxtəlif məlumat mənbələrini və nümunələri əlaqələndirməyi və asanlıqla izahını verməyi bacarırlar. Yaxşı riyazi biliklərə, qabiliyyətə malik olan şagirdlər öz düşüncə və qabiliyyətlərini riyazi məsələlərin həllində tətbiq edir, biliklərini daha yeni yanaşma və strategiyalarla nümayiş etdirir, əldə etdikləri nəticələri əsaslandıra, dəlillərlə izahını verməyə nail ola bilirlər.

• Müəllimlər xüsusi qabiliyyətli və istedadlı şagirdlər də daxil olmaqla xüsusi qayğıya ehtiyacı olanların təlimi ilə bağlı məsələləri dərk edərək kurikulumu qiymətləndirməyi lazım olan tərzdə dəyişə bilə və hamılıqla xüsusi qayğıya ehtiyacı olan şagirdlərə aid dövlət qanunlarına, qaydalara və siyasətə riayət edirlər.

Hamıya məlumdur ki, riyazi səriştə həyatda hər bir insan üçün vacibdir.

• Riyazi səriştə əldə etmək üçün şagirdlər əsas konsepsiyaları anlamağı, prosedur və alqoritmləri tez və dəqiq izləməyi, problemləri həll etmək üçün bir neçə strategiyadan istifadə etməyi, düşüncələrini çatdırmağı bacarmalıdır, riyaziyyatın əhəmiyyətini anlamalı və onu öyrənə biləcəyinə inanmalıdırlar.

• Çünki şagirdlərin riyazi bacarıqlarının inkişafı üçün ailələr və məktəbdə kollektiv içərisində sıx əməkdaşlıq münasibətlərinin formalaşdırılması məhz müəllimin üzərinə düşür və bu da işin xeyrinə olur.

• Riyazi bacarıqların inkişafı üçün riyazi klublar və yarışmaların təşkili çox faydalı olur.

Məlumdur ki, riyaziyyat insanın dünyanı onun məzmununu, xaosunu, sabitliyini və dəyişikliyi anlamaq cəhdində əsas vasitədir. Riyaziyyat ən qədim fənlərdən olmasına baxmayaraq o günü-gündən öz sahəsini genişləndirir, deməli, dəyişir və eyni zamanda dünyanı da dəyişməyə qadir olur. Bu zaman onu tədris edən müəllimlər hər zaman öz biliklərini təzələməlidirlər. Bu məqsədlə onlar internetdən, peşəkar jurnallardan istifadə etməli və konfranslarda iştirak etməlidirlər.

Şagirdlərin riyaziyyat fənnini daha maraqla öyrənməsi və daha asanlıqla qavraması üçün onlara təqdim ounan tapşırıqların çox cazibəli və eyni zamanda sanki həyatın real situsiyalarına uyğun olaraq və sözün əsl mənasında problem şəklində tərtib olunmalıdır.

Bu gün riyaziyyatı model məsələlərin geniş tətbiqi ilə tədris etməyin əsl vaxtı

gəlib çatmışdır. Bəs modelləmə nədir?

Müasir dövrdə alimlər dünyanı daha aydın bir şəkildə anlaya bilmək və sonra texniki sualları cavablandıra bilmək məsələlərində riyaziyyatın tədrisinin daha münasib bir formaya salınmasının çox önəmli olması vurğulanır. Reallığı riyazi bir dil ilə qavramağa kömək edən bu metod və düşüncə formasına riyazi modelləmə adı verilir.

Məhz onda şagird riyaziyyatı hər bir şeydən təcrid olunmuş maraqsız bir halda deyil, bütövlükdə həyatın içindən götürülmüş problemlərin həllinə yönəldilərək öyrədilərsə onun gələcəkdə həyata daha hazır bir şəkildə hazırlanmasına nail olmaq olar. Beləliklə, şagird məktəbi bitirəndə artıq onda mühəndis, texnoloji və riyazi təfəkkür tərzi formalaşmış olduğundan bütövlükdə cəmiyyətin səviyyəsi yüksəlmiş ola bilir. Beynəlxalq aləmdə riyaziyyatın bu cür tədrisi proqramını STEM (Fənn, Texnoloji, Mühəndislik, Matematik) deyə adlandırırlar.

Qeyd etmək lazımdır ki, qiymətləndirməyə dair beynəlxalq təcrübə Azərbaycana çox şey vermişdir. Məsələn, daha çox həyati bacarıqları yoxlayan qiymətləndirmə tədqiqatlarında iştirak etməklə ölkəmiz qazandığı təcrübə sayəsində sivil təhsil srategiyalarını müəyyənləşdirməyə nail olmuşdur. Bundan əlavə məhz təcrübə əsasında fənn kurikulumlarında hansı zəruri dəyişikliklərin edilməsi proqnozlaşdırılmış, şagirdlərimizə dünya təhsil standartlarına cavab verən qiymətləndirmə vasitələri ilə işləmək vərdişləri aşılanmışdır. On ildən artıqdır ki, bu istiqamətdə təcrübə qazanmaq məqsədilə TIMS və PIRLS beynəlxalq qiymətlən-dirmə proqramları ilə əlaqəli işlər görülmüşdür. Dəfələrlə rəhbərlik üçün qəbul edilən sənədlərdə və pedaqoji mətbuatda deyilmişdir ki, əgər PISA əsas sənaye ölkələrində məktəb sisteminin nəticələrinə dair müqayisəli faktları verməklə şagirdlərin real həyatda oxu, riyaziyyat və təbiət elmləri sahəsində bilik və bacarıqlarının tətbiqini qiymətləndirirsə, PIRLS və TIMS müxtəlif ölkələrdə şagirdlərin oxu, riyaziyyat və təbiət elmləri sahəsində rəsmi məktəb kurikulumunun məzmununa nə dərəcədə yiyələndiklərini təhlil edir. Son vaxtlarda təsdiq olunmuşdur ki, məktəblilərin nəticələrinin digər ölkələrin nəticələri ilə müqayisəli təhlili sayəsində riyaziyyat fənninin tədrisinin mükəmməlləşdirilməsində istiqamətləri təyin etməyə, eyni zamanda milli mütəxəssislərin araşdırmasını tələb edən problemlərin üzə çıxmasına imkan verəcək. Həyati bacarıqlara görə qiymətləndirmə sahəsində müəyyən təcrübə qazandıqdan sonra milli kurikulumun, yeni qiymətləndirmə sisteminin tətbiq edildiyi təhsil pillələrində şagirdlərimizin beynəlxalq standartlara nə dərəcədə cavab verməsini öyrənmək müəllimlər üçün mühüm əhəmiyyətə malikdir. Azərbaycanın TIMS və PIRLS beynəlxalq qiymətləndirməsinə qoşulması qiymətləndirmə və təhlillər aparmaq təcrübəmizi xeyli artırmış, dünya təcrübəsində orta məktəblərdə təhsilin səviyyəsini öyrənmək üçün aparılan ən populyar tədqiqatlardan birinə çevrilmişdir. Təcrübə və araşdırmalar göstərir ki, riyaziyyat fənninin tədrisindəki nailiyyətlərin qiymətləndirilməsində bir sıra ümumi yanaşmalar müəyyən olunmuş, görülən işlərin təhlili ilə bağlı informasiyalar toplanmış, burada bəzi əsaslı faktlar üzə çıxarılmışdır.

Bir məsələ tam aydındır ki, TIMS və PIRLS beynəlxalq qiymətləndirmə proqramlarının populyarlıq qazanması tədqiqatda

istifadə olunan qiymətləndirmə vasitələrinin təhsilalanların həm bilik, həm də bacarıqlarının üzə çıxarılmasında və gələcək nailiyyətlər üçün ölkələrin bu vasitələrdən bəhrələnməsində müstəsna əhəmiyyət kəsb edir. Lakin bir sıra həll olunmamış problemlər də vardır. Azərbaycan məktəblilərinin qazandığı uğurlar, şagirdlərin mövcud qiymətləndirmə vasitələri ilə daha yaxından tanış olmaları həm məktəbdəki nailiyyətlərimizə, həm də şagirdlərimizin dünyagörüşündə müsbət təsirlər yaradacağına ümid yaradır.

Türkiyə ölkəsinin bir qrup müəllimləri, o cümlədən İzmir Qız Lisəsinin riyaziyyat müəllimi Uğur Çətinkaya dünyada və Avropada bu sahədəki mövcud təcrübədən yararlanaraq MAGİT-Matematiksel Güc ve İnnovativ Tasarım Derneyi yaradaraq riyaziyyatda modelləmə üsulunun tətbiqinə dair fəaliyyətini bu dərnək vasitəsilə yönləndirmişdir. Bu təlim növünə görə riyaziyyatın tədrisində əsasən iki istiqamətin parlaq tətbiqi diqqəti cəlb edir. Birincisi, onlar texnologiyanın geniş tətbiqini xüsusi GEOGEBRA proqramı vasitəsilə reallaşdırırlar ki, bu da şagirdlərin riyaziyyatda keçdikləri materialların daha əyani şəkildə mənimsəyərək işləmələrinə imkan yaradır. Eyni zamanda riyaziyyatın məsələlərinin tam gündəlik həyatın problemlərinə uyğun şəkildə tərtib olunması və onların həllininin alışdırılması şagirdlərin həyata hazırlığını və çevik riyazi təfəkkürünün formalaşmasını təmin edir.

Beləliklə, STEM-nəzəri bilikləri praktikada tətbiq etməyə ,bu biliklərin materiyaya çevrilməsi və yenilikçi kəşflərə sövq edən, şagirdlərin riyaziyyat, mühəndislik, texnologiya və digər fənlərdən öyrəndiklərini bir bütövün parçaları kimi görmələrinə alışdırmağa çalışan, dünyada bir çox ölkələrin artıq özlərinin tədris proqramına daxil etdiyi bir tədris yanaşması olmaq xüsusiyyətini daşıyır.

STEM təhsili – istehsal, kəşfetmə bilik və bacarıqlarını qazandırmağı hədəfləyir. STEM təhsili almış şəxslərin iş dünyasına daxil olanda da bu bacarıqların sayəsində iş həyatlarında istədikləri istiqamətə asanlıqla uyğunlaşması və ölkənin iqtisadi inkişafına layiqli töhfə verməsi gözlənilir. STEM təhsili dünyada məktəbəqədər təhsildən ali təhsil də daxil olmaqla tədris prosesində fənlərarası əlaqəyə uyğun şəkildə tətbiq edilir.

MAGİT dərnəyinin üzvləri fəaliyyətindəki bütün maraqlı cəhətlərlə vaxtaşırı Türkiyənin Təhsil Nazirliyinin qarşısında öz hesabatları ilə çıxış edirlər.

STEM-in (Fənn, Texnoloji, Mühəndislik, Riyaziyyat) fəaliyyətinə dair növbəti Təhsil Hesabatından bəzi məqamları diqqətinizə çatdırmaq istərdim.

Hesabatda STEM təhsilinin təşəkkülü barədə məlumat verilmişdir. Belə ki, ABŞ-da və müxtəlif Avropa ölkələrində STEM təhsili ilə bağlı vəziyyət ortaya qoyuldu. Türkiyədə STEM təhsili ilə bağlı vəziyyət təhlil edildi və bu təhsil növünə keçmək məqsədilə yeni model təklif olundu. STEM təhsil mərkəzləri barədə araşdırmaların aparılması, müəllimlərin bu tədris formasına uyğun olaraq yetişdirilməsi, tədris proqramlarının STEM-ə uyğunlaşdırılması və məktəblərdə tətbiq üçün lazımi şəraitin qurulması üçün zəruri dərs materialları ilə təmin olunması məsələlərinə toxunuldu .

STEM təhsili ilə türk təhsil sistemi-

nin sintezi üçün lazımi hazırlıqlarla əlaqədar qiymətləndirmələr apararaq bu növ təhsilə uyğun tədris planı təqdim edildi. Və artıq onlar öz məhsuldar fəaliyyətləri ilə bu istiqamətdə hər cür dövlət dəstəyinə də layiq görüldükləri üçün biz də buradan həmkarlarımıza uğurlar diləyirik. Onlar əmindirlər ki, bu yanaşma ilə riyaziyyat müəllimləri nəinki ən geridə qalmış riyazi durumu tez bir zamanda düzəldə biləcəkdir, hətta beynəlxalq qiymətləndirmənin növbəti sınaqlarında onlar daha yüksək yerlər qazanacaqlar. Çünki artıq bir çox qabaqcıl ölkələrdə sınaqdan çıxarılmış bu riyaziyyatın yeni üsulla tədrisi demək olar ki, bütün dünyada öz effektini göstərməkdədir.

***Rəyçi: dos. İ.Cavadov***

## İstifadə edilmiş ədəbiyyat

1. Ağayev Ə. Pedaqoji innovasiyalar probleminə müasir yanaşmalar. Azərbaycan məktəbi, 2013, №5.

2. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri. Bakı, 2014.

3. Süleymanova A. Müasir kurikulumlarda yeni təlim yanaşmalarının tarixi kökləri. Kurikulum, 2008.

4. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, №5.

5. Ağayev Ə. Təlim prosesi: ənənə və müasirlik. Bakı, 2006.

6. Tahirov B., Namazov F. və b. Riyaziyyatın tədrisi üsulları. Bakı, 2007.

7. Heydərova S. Riyaziyyat fənninin keyfiyyətini yüksəldən üsullar. “Təhsil problemləri” qəzeti. 2013, 27 sentyabr.

8. İdarəetmədə qərarların verilməsi təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi və monitorinq tədqiqatlarının nəticələrindən istifadəyə dair vəsait. Xəzər Universiteti Nəşriyyatı. Bakı, 2013.

**С.Агаева**
**Э.Мамедова**

**Модели и подходы в современном обучении**

**Резюме**

В статье говорится о важности увеличения интереса к математике в экономической и инженерной сфере страны. О том чтобы получить желаемые результаты необходимы современные подходы и модели в преподавании этого предметf.

**S.Agayeva**
**E.Mammadova**

**Models and approaches in modern teaching**

**Summary**

The article discusses the importance of increasing the interest in mathematics in engineering and economic sphere of the country. About to get the desired results, the need to use advanced models and approaches in teaching mathematics.



# TƏDRİS RESURSLARINDAN İSTİFADƏ ZAMANI QARŞIYA ÇIXAN PROBLEMLƏR HAQQINDA

**Nərminə Məmmədova,**
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

Məqalədə tədris avadanlıqları və resurslarının təhsildə tətbiqi və tədris prosesində istifadə olunması xüsusiyyətləri nəzərdən keçirilir. Araşdırmada məlumat toplama vasitəsi kimi anket sorğusundan istifadə olunmuşdur. Alınmış nəticələr müasir yanaşmalar əsasında təhlil edilmiş, ümumiləşdirmələr aparılmış və müvafiq təkliflər verilmişdir.

***Açar sözlər:*** *məktəb, ictimai fənlər, müəllim, şagird, müasir təhsil, təhsilin məzmunu, müasir texnologiya, tədris avadanlıqları, tədris resursları.*

***Ключевые слова:*** *школа, общественные предметы, учитель, ученик, современное образование, содержание образования, современные технологии, учебное оборудование, учебные ресурсы.*

***Key words:*** *school, social studies, teacher, student, modern education, content of education, modern technology, training equipment, training resources.*

Təhsil səviyyəsi yüksək olan ölkələrdə inkişafın yüksək olması təbiidir. Təhsilə diqqətin ilbəil artırılması çox düzgün addımdır. Çünki tərəqqiyə ən çox təsir edən amil məhz təhsildir.

Azərbaycan müstəqillik qazandıqdan sonra cəmiyyətin bütün sahələrində olduğu kimi, təhsil sahəsində də həm forma, həm də məzmunca, beynəlxalq təcrübənin son nailiyyətlərinə müvafiq ciddi dəyişikliklər edilmiş, milli təhsil sisteminin əsası qoyulmuşdur. Azərbaycan Respublikasında təhsillə bağlı son dövrlərdə qəbul edilmiş bütün normativ-hüquqi aktlarda bu məsələ xüsusi diqqət mərkəzində saxlanılmışdır.

Təhsildə qarşıya qoyulan bir sıra məsələlər bu gün də problem kimi həllini gözləməkdədir.

Dünyanın müasir inkişaf tendensiyası, elm və texnologiyanın sürətli inkişafı, məktəblərdə istifadə olunan tədris avadanlıqları və resursları arasındakı əlaqələrin məna və məzmununda, prinsip və metodlarında yaranan yeniliklər bu istiqamətdə bilik və bacarıqların artırılması ilə bağlı məsələləri əks etdirən araşdırmalara ehtiyac yaradır.

Məktəblərdə keyfiyyətli bilik vermək mövzuya uyğun olaraq seçilmiş müasir tədris avadanlığı və resursun səmərəli istifadə edilməsi ilə sıx bağlıdır. Öyrətmə-öyrənmə prosesində müasir tədris avadanlıqları və resursları təhsili dəstəkləmək məqsədilə istifadə edilir. Yaxşı hazırlanmış və seçilmiş müasir tədris avadanlıqları və resursları tədris prosesini zənginləşdirir, müvəffəqiyyəti yüksəldir.

ABŞ-ın Texas Universitetində aparılan bir araşdırmanın nəticəsinə görə, zaman amili sabit tutulduğunda şagirdlərin: oxuduqlarının ondan biri, eşitdiklərinin beşdən biri, gördüklərinin üçdən biri, eşidib-gördüklərinin tam yarısı, söylədiklərinin üçdə ikisi və edib-söylədiklərinin onda doqquzu hafizələrində qalır.

İctimai fənlərin tədrisində də müasir tədris avadanlıqları və resurslardan istifadə

etdikdə şagirdlər mövzunu daha yaxşı mənimsəyirlər. Bunun üçün tədris resurslarının yaxşı hazırlanması və planlı şəkildə istifadə edilməsi lazımdır. Təhsildə istifadə ediləcək tədris avadanlıqları və resursları şagirdlərin təlim və yaş xüsusiyyətlərinə uyğun olmalıdır.

Müəllimlər müxtəlif təlim strategiyalarını ehtiva edən təlim fəaliyyətlərini tədris ilinin əvvəlində planlaşdırmalı və şagirdlərin özünü istiqamətləndirərək, öyrənmə hədəfini reallaşdırmaq üçün müvafiq öyrətmə-öyrənmə şəraiti yaratmalıdırlar. Tədris prosesinin yüksək səviyyədə planlaşdırılması dərsdə istifadə ediləcək resursların keyfiyyətinə də öz təsirini göstərir. Tədris prosesinin beş mərhələdən ibarət planlaşdırılmasında nəzərdə tutulmuş hədəflərin həyata keçirilməsində istifadə ediləcək tədris avadanlıqları və resurslarının müəyyən edilməsi, sonrakı təlim prosesi üçün xüsusi əhəmiyyət daşıyır. Çünki təhsil hədəflərinə məktəblərin imkanları daxilində çatmaq olar. Tədris proqramının illik və cari planlaşdırılmasında və ya tətbiqində istifadə edilməsi nəzərdə tutulan tədris avadanlıqları və resurslarının əldə edilmək imkanlarının mövcud vəziyyəti nəzərə alınmalıdır.

Müasir tədris avadanlıqları və resurslarından istifadə edilməsi heç də bunların müəllimləri əvəzləmək mənasına gəlmir. Əksinə, müasir tədris avadanlıqları və resurslarından istifadə müəllimlərin məlumat verən olmaq əvəzinə, təlim prosesində şagirdlərə bələdçi olmasını təmin edir.

Müəllimlər yalnız tədris avadanlığı və resursdan istifadə etməklə işin bitmədiyini, məqsədə ən münasib olanı seçməyin zəruriliyini də bilməlidirlər. Yalnız verbal üsulla təlim keçməyi düşünən bir müəllim audio-vizual resurslardan istifadə etməklə təlim prosesini zənginləşdirə bilər. Müəllim məqsədəmüvafiq tədris avadanlıqları və resursları müəyyənləşdirdikdən sonra bunların tətbiqi üçün ciddi və ardıcıl səy göstərməlidir.

Bu məsələ ilə bağlı qərb ölkələrində araşdırma aparan tədqiqatçılardan Streeterin müəllimlərin tədris avadanlığı və resurslarından istifadə edilməsinə yönəlmiş araşdırmasında alınan nəticə, müəllimlərin qabiliyyətləri, müvafiq bilik və bacarıqları ilə tədris avadanlığı və resursların istifadəsi arasında müsbət bir əlaqə olduğunu müəyən etmişdir.

Amerikalı pedaqoqlar J.Lloyd, L.Dean və D.Coperin müasir tədris avadanlıqları və resurslardan istifadə edilməsi, bunun şagirdlərin akademik nailiyyətlərinə təsiri ilə bağlı apardıqları araşdırmanın nəticəsində müəyyən edilmişdir ki, şagirdlərin akademik müvəffəqiyyətlərinə müsbət təsiri olmasına baxmayaraq, heç də bütün dərslərdə bu müsbət xüsusiyyətlər özünü göstərmir. Onların tədqiqatdan əldə etdikləri nəticə müəllimlərin səviyyəsinin və onların texnoloji avadanlıqlardan istifadə bacarıqlarının kifayət qədər olmamasının şagirdlərə mənfi təsir etdiyini ortaya çıxarmışdır.

H.Aksoyun "Tədris avadanlıqları və kompüter texnologiyasının təhsildə istifadəsinin təsiri ilə bağlı tənqidi görüşlər", A.Yılmazın "Müəllimlər tərəfindən təlim texnologiyalarının istifadəsinə aid tədqiqat", N.Məmmədovanın "Humanitar fənlər üzrə tədris resurslarının məzmununa müasir yanaşma" adlı araşdırmalarında müasir tədris avadanlıqları və resursların ümumtəhsil məktəblərində istifadəsi zamanı qarşıya çıxan problemlərin təhsil sisteminin ən aktual problemi kimi qiymətləndirilməsi, həmçinin pedaqoji və psixoloji elmi əsaslarının işlənməsinin zəruriliyi vurğulanmışdır. Tədqiqatlarda müəllimlərin təlim

prosesində İKT-dən istifadəsində böyük qüsurların olduğu, müasir tədris avadanlıqlarının (İKT), xüsusən kompüterli təhsilin təhsil sistemində köklü dəyişikliklər yaradacağına dair güclü bir inam olmasına baxmayaraq, onlardan məktəblərdə kifayət qədər istifadə edilmədiyi, mövcud təhsillə texnologiyanın birləşdirilməsinin hələ də problem olaraq qaldığı məlum olmuşdur.

Təbii ki, müasir tədris avadanlıqları və resurslarından təlim prosesində istifadə edən müəllimin təlim keyfiyyəti, şagirdlərinin uğuru daha yüksək olur. Təhsilin digər sahəsində olduğu kimi, ictimai fənlərin tədrisində də mövzular daha davamlı və asan öyrədilməli, təlimin daha səmərəli və effektliyini təmin edəcək hər cür müasir tədris avadanlıqları və resurslarından istifadə edilməlidir. Məktəblərdə müasir tədris avadanlıqları və resursları ilə bağlı mövcud vəziyyət, çatışmazlıqlar, köhnəliyi, istifadə vəziyyəti və məqsədləri, təmini, hansı dərslərdə daha çox istifadə edildiyi, şagird müvəffəqiyyətinə olan təsiri və müəllimlərin onlardan istifadə bacarıqları və s. ilə bağlı Roşelli və başqa yoldaşlarının, həmçinin Yeşilyurtin apardığı araşdırmalar bu baxımdan böyük əhəmiyyət kəsb edir.

Pedaqoji mətbuatda çap olunan son məqalələrdə Azərbaycan Respublikasında 12 illik təhsil sisteminin yaradılmasında infrastrukturun, müvafiq tədris avadanlıqları və resurslar bazasının yaradılması mühüm şərt kimi qarşıya qoyulmuşdur.

“Müasir təhsil: axtarışlar və perspektivlər” adlı kitabda, Fikret Tuna və Murat Ateşin həmmüəllif olduqları “Orta məktəb şagirdlərinin coğrafiya dərslərində və gündəlik həyatlarında müxtəlif texnologiyalardan istifadə etmələri” adlı araşdırmada təhsilin modernləşdirilməsində müasir tədris avadanlıqları və resurslarının məqsədəuyğun istifadəsinin böyük əhəmiyyət daşıdığı, tədris prosesi zamanı müasir tədris avadanlıqları və resurslarına (İKT əsaslı) əsaslanan metodikalardan istifadənin üstünlükləri, məktəblərin tədris avadanlıqları və resurslarla təchizatı ilə bağlı müvafiq tədbirlərin həyata keçirilməsi, multimedia xarakterli dərsliklərin, digər tədris vəsaitlərinin təhsil prosesinə geniş tətbiqi, vahid elektron təhsil məkanının inkişaf etdirilməsinin vacibliyi diqqətə çatdırılmışdır.

Müasir tədris avadanlıqları və resursların, xüsusilə kompüter texnologiyasına əsaslanan resursların ictimai fənlərin təlimindəki yerini və əhəmiyyətini ortaya çıxaran tədqiqat işlərinə böyük ehtiyac duyulmaqdadır. Məhz göstərilən amillər baxımından bu araşdırmaya ehtiyac yaranmışdır.

İctimai fənn müəllimlərinin müasir tədris avadanlıqları və resurslarından istifadə etmə səviyyələri, istifadə əsasında qarşıya çıxan problemləri müəllimlərin fikirlərinə əsaslanaraq, müəyyən etmək məqsədilə aparılan bu araşdırmada aşağıdakı suallara cavab axtarılmışdır:

1. Məktəblərdə ictimai fənn müəllimlərinin təlim zamanı istifadə edə biləcəkləri müasir tədris avadanlıqları və resursları ilə təminat nə səviyyədədir?

2. Məktəblərdə ictimai fənn müəllimlərinin müasir tədris avadanlıqları və resurslardan istifadə ilə bağlı bilik və bacarıqları hansı səviyyədədir?

3. Tədris avadanlıqları və resurslardan istifadə məsələsində sinif mühitində şagirdlərin sayı və fiziki şəraitin olması ilə bağlı problemlər müşahidə olunurmu?

4. Məktəbin tiplərinə görə tədris avadanlıqları və resurslardan istifadə məsələsində fərqliliklər hansı səviyyədədir?

5. İctimai fənn müəllimlərinin müasir tədris avadanlıqları və resurslarından sistemli

şəkildə istifadə edə bilməmələrinin səbəbləri hansılardır?

Tədqiqatda ictimai fənn müəllimlərinin təlim prosesində müasir tədris avadanlıqları və resurslardan istifadəsinə təsir edən səbəblər araşdırılmışdır.

2014/2015-ci tədris ilində Azərbaycanın Şimal, Qərb, Şərq və Cənub bölgələrini əhatə edən Gəncə, Lənkəran şəhərlərinin, Oğuz, Qəbələ və Quba rayonlarının məktəblərində aparılan sorğularda ümumilikdə səkkiz sualdan istifadə olunub. Sorğunun nəticələri SPSS 15 proqramının köməyi ilə təhlil edilmiş, ortaya çıxan nəticələr cədvəllər və qrafiklər vasitəsi ilə şərh olunmuş, əldə olunan nəticələr müqayisə edilmiş, tədris prosesində tədris avadanlıqları və resurslardan tam istifadə edilməsinə mane olan səbəblər, istifadə zamanı ortaya çıxan problemlər müəyyən edilmişdir.

Anket sorğusunda tədris prosesində müasir tədris avadanlıqları və resurslarından (gerçək əşya və model, vizual, kompüter, internet, proyektor, video, CD/DVD, ağıllı (smart) lövhədən) istifadə edilməsinə mane olan səbəblərlə bağlı 30 ictimai fənn müəlliminin fikirləri ortaya çıxarılmış, nəticələr ümumiləşdirilmişdir.

Aparılan təhlil göstərir ki, tipik dövlət məktəblərində və “Ən yaxşı ümumtəhsil məktəbi” müsabiqəsinin qalibi olan məktəblərdə, demək olar ki, ictimai fənlərin tədrisində vizual (sxem, qrafik, xəritə və s.) resurslardan istifadə ilə bağlı sualla əlaqədar bütün göstəricilər eyni olub, elektron resurslarla müqayisədə xeyli yüksəkdir. Belə ki, hər iki məktəb tipində müəllimlərin cavab göstəriciləri “Tədris avadanlıqları və mövzuya uyğun resurs məktəbdə yoxdur” 20 faiz, “Şagirdlərin sayı və fiziki şəraitin olmaması ilə bağlı problemlər var” 30 faiz, "Problem yoxdur" 50 faiz təşkil edir.

Hər üç məktəb tipində ictimai fənn müəllimlərinin ümumi cavab göstəriciləri “Tədris avadanlıqları və mövzuya uyğun resurs məktəbdə yoxdur” - 20 faiz, “Şagirdlərin sayı və fiziki şəraitin olmaması ilə bağlı problemlər var” - 20 faiz, "Problem yoxdur" - 60 faiz təşkil edir.

Araşdırmaların nəticələrinə əsasən, məktəblərdə ictimai fənlərin tədrisində video, CD, DVD və slaydlardan istifadə ilə bağlı cavab göstəriciləri “Tədris avadanlıqları və resurs istifadə bacarığına malik deyiləm” -10 faiz, “Şagirdlərin sayı və fiziki şəraitin olmaması ilə bağlı problemlər var”- 40 faiz, “Tədris avadanlıqları və mövzuya uyğun resurs məktəbdə yoxdur” isə müvafiq olaraq 40-30 faizarası, "Problem yoxdur" isə 10-20 faizarası təşkil edir.

“Elektron məktəb”lərdə isə bu göstəricilər belədir: 30 faiz - “Şagirdlərin sayı və fiziki şəraitin olmaması ilə bağlı problemlər var”, 70 faiz -"Problem yoxdur". Hər üç məktəb tipində ictimai fənlərin tədrisində video, CD, DVD və slaydlardan istifadə üzrə ümumi nəticələr digər resurslarla nisbətdə yuxarıdır.

Təhlillərə əsasən, məktəblərdə ictimai fənlərin tədrisində kompüterdən istifadə ilə bağlı ayrı-ayrılıqda cavab göstəriciləri də maraq doğurur.

Belə ki, ictimai fənlərin tədrisində kompüterdən istifadə ilə bağlı müəllimlərin ümumi cavab göstəriciləri “Tədris avadanlıqları və mövzuya uyğun resurs məktəbdə yoxdur” 16,67 faiz, “Tədris avadanlıqları və resurs istifadə bacarığına malik deyiləm” 10 faiz, “Şagirdlərin sayı və fiziki şəraitin olmaması ilə bağlı problemlər var” 26,67 faiz, "Problem yoxdur" 46,67 faiz təşkil edir.

Araşdırmalara əsasən, ictimai fənlərin tədrisində internetdən istifadə ilə bağlı ayrı-ayrı cavab göstəriciləri də maraqlıdır.

Məktəblərdə ictimai fənn müəllimlərinin tədris prosesində internetdən

istifadə etməmələrinin səbəbləri ilə bağlı ümumi cavab göstəriciləri “Tədris avadanlıqları və mövzuya uyğun resurs məktəbdə yoxdur” 23,33 faiz, “Tədris avadanlıqları və resurs istifadə bacarığına malik deyiləm” 6,67 faiz, “Şagirdlərin sayı və fiziki şəraitin olmaması ilə bağlı problemlər var” 23,33 faiz, "Problem yoxdur" 50,00 faiz təşkil edir.

Öyrənilmiş təcrübəyə əsasən, məktəblərdə ictimai fənlərin tədrisində proyektordan istifadə ilə bağlı ayrı-ayrı cavab göstəriciləri də müxtəlifdir. Belə ki, bunlar 10, 20, 30 faiz təşkil edir.

Araşdırma aparılan məktəblərdə ictimai fənlərin tədrisində proyektordan ümumi istifadə göstəriciləri: “Tədris avadanlıqları və mövzuya uyğun resurs məktəbdə yoxdur” 23,33 faiz, “Tədris avadanlıqları və resurs istifadə bacarığına malik deyiləm”-6,67 faiz, “Şagirdlərin sayı və fiziki şəraitin olmaması ilə bağlı problemlər var”-16,67 faiz, "Problem yoxdur"-53,33 faiz təşkil edir.

Araşdırmalara əsasən, ictimai fənlərin tədrisində ağıllı (smart) lövhədən istifadə edilməmə səbəbləri ilə bağlı cavab göstəriciləri də bəzi problemlərin həllinin istiqamətləndirilməsinə kömək edər. Məsələn, “Elektron məktəb”lərdə cavab göstəriciləri "Problem yoxdur"-70 faiz, “Tədris avadanlıqları və mövzuya uyğun resurs məktəbdə yoxdur”-10 faiz, “Tədris avadanlıqları və resurs istifadə bacarığına malik deyiləm”-20 faiz təşkil edir.

Nəticələr, yuxarıda bəhs olunan digər müasir tədris avadanlıqlarında olduğu kimi, hər üç məktəb tipində ağıllı (smart) lövhədən istifadə göstəricisinin çox aşağı olduğunu göstərir. Təhlil edilən tədris avadanlıqları və resurslar içərisində ən aşağı göstərici məhz, ağıllı (smart) lövhənin istifadəsində müşahidə olunmuşdur.

Beləliklə, anket sorğusunun təhlilindən alınan nəticəyə görə, ümumilikdə ölkənin təhsil sahəsində xeyli dərəcədə müsbət dəyişikliklər baş vermişdir. Tədqiqat iştirakçılarının, yəni müəllimlərin əksəriyyətinin fikrincə, keçmişlə müqayisədə, hazırda ictimai fənn müəllimlərinin fəaliyyətində müasir tədris avadanlığı və resurslardan istifadəyə daha çox diqqət yetirilir.

Müvafiq tədris avadanlığı və resurslardan istifadə mühitlərinin məktəb tiplərinə görə dəyişiklik göstərib-göstərmədiyinin araşdırılması nəticəsində, məktəb tipləri arasında statistik olaraq əhəmiyyətli bir fərqlilik olduğu ortaya çıxmışdır. Belə ki, alınan nəticə ölkəmizdə “Elektron məktəb”lər istisna olmaqla, digər məktəb tiplərində ictimai fənn müəllimlərinin lazım olan müasir tədris avadanlığı və resursları əldə etmə, istifadə məsələsində müəyyən çatışmazlıqların olduğunu, tədris prosesində tam olaraq istifadə edilmədiyini göstərmişdir.

Ümumtəhsil məktəblərində ictimai fənlərin tədrisində resurslardan istifadə üzrə ən yüksək göstərici özünü vizual (sxem, qrafik, xəritə və s.) resursların istifadəsində göstərir. Bəzi məktəblərin ağıllı (smart) lövhədən ümumi istifadə ilə bağlı göstəriciləri hələ qənaətləndirici deyildir.

Tədris avadanlığı və resursların mürəkkəb strukturda olması və ya müəllimlərin müasir tədris avadanlığı və resurs istifadə etmə ilə əlaqədar məlumatlarının və bacarıqlarının zəif olması da, təhlil nəticəsində ortaya çıxan bir həqiqətdir.

Ağıllı (smart) lövhədən ümumi istifadə ilə bağlı göstəricilərin aşağı olmasının əsas səbəbləri ilk növbədə bu tədris avadanlığının tədris prosesində son illərdə istifadə edilməyə başlaması, müəllimlərin ondan istifadə etməklə bağlı müvafiq bilik və bacarıqlarının zəif olmasıdır. Digər səbəb

isə, məktəblərdə bu avadanlıqların tətbiqi ilə bağlı münasib şəraitin təmin edilməməsidir.

Təhlildən çıxan nəticə, ölkəmizdə tədris prosesində "Elektron məktəblər" istisna olmaqla, digər məktəb tiplərində ictimai fənlərin tədrisində müasir tədris avadanlığı və resurslarla istifadəyə kifayət qədər yer verilmədiyini, onlardan dağınıq şəkildə, sistemsiz istifadə edildiyini göstərir.

Aşağıdakı təklifləri vermək məqsədə uyğundur:

- İlk növbədə ümumtəhsil məktəblərində mövcud olan müasir tədris avadanlıqları və resurslarından ictimai fənlərin tədrisində səmərəli şəkildə istifadənin təmin edilməsi;
- Ümumtəhsil məktəblərində ictimai fənn müəllimlərinin illik və tematik planlaşdırmasında müasir tədris avadanlıqları və resurslarından istifadə ilə əlaqədar müvafiq fikirlərin öz əksini tapması;
- Orta ümumtəhsil məktəblərində müasir tədris avadanlıqları və resurslarla təchiz edilmiş ictimai fənn kabinetlərinin sayının artırılması və kabinetlərdəki müasir tədris avadanlıqları və resurslardan istifadə etmək üçün ictimai fənn müəllimlərinə xidmətdaxili təlim verilməsinin təmin edilməsi;

Aparılan araşdırma məktəblərdə olan tədris avadanlığı və resursların istifadəsində qüsurların aradan qaldırılması baxımından böyük əhəmiyyətə malikdir.

Araşdırmadan alınan nəticə, texnologiyanın sürətlə inkişaf etdiyi günümüzdə məktəblərin müasir tədris avadanlıqları və resursları ilə təchiz edilməsi ilə bağlı məktəblərin tipləri arasındakı fərqin aradan qaldırılması, müəllimlərin müvafiq sahədə olan yeniliklərlə bağlı məlumatlandırılması işinə böyük töhfə verəcəkdir. Bu isə özlüyündə təhsilin keyfiyyətinin artmasını təmin edəcəkdir.

***Rəyçi: dos. Ə.Abbasov***

## İstifadə edilmiş ədəbiyyat


1. "Azərbaycan Respublikasında informasiya cəmiyyətinin inkişafına dair 2014-2020-ci illər üçün Milli Strategiya haqqında". http.e-qanun.az.
2. "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı". //Azərbaycan məktəbi, 2015, №1.
3. Нейматов Я. Образование в XXI веке: тенденции и прогнозы. Москва: Алгоритмы, 2002.
4. Селевко Г. Технологические подход к образовании. Москва, 2000.
5. Məmmədova N. Tədris resurslarının istifadəsində müəllimin rolu. "Humanitar elmlərin öyrənilməsinin aktual problemləri" kitabı. Bakı, 2016, №2.
6. Cuban L. Computers in the classroom. Cambridge, MA: Harward University Press. 2001.


**Н.Мамедова**

**О проблемах возникающих при использовании учебных ресурсов**

**Резюме**

В данной статье рассматриваются проблемы использования учебных оборудований и ресурсов во время учебного процесса. В исследовании использовано как средство сбора анкеты с содержанием вопросов. Полученные результаты анализированы на основе современных взглядов, проведено обобщение и даны соответствующие предложения.

**N.Mammedova**

**The problems arising from the use of educational resources**

**Summary**

The article introduces the possibilities of using training equipment-training resources (information and communication technologies) faced with reason of problem in education. The study used questionnaires as a means of quiz questions.The obtained results are analyzed, carried out generalizations and appropriate proposals are given.

# İLK PEŞƏ-İXTİSAS TƏHSİLİ MÜƏSSİSƏLƏRİNDƏ FƏALİYYƏT GÖSTƏRƏN MÜHƏNDİS-PEDAQOJİ HEYƏTİN MONİTORİNQİ MƏSƏLƏLƏRİ



**Rəsul Əsgərov,**
*Azərbaycan Respublikası Təhsil İnstitutunun peşə ixtisas təhsili şöbəsinin müdiri, əməkdar müəllim*

**Malik Qurbanov,**
*həmin şöbənin aparıcı elmi işçisi*



Məqalədə peşə təhsili müəssisələrində çalışan mühəndis-pedaqoji heyətin keyfiyyət və peşəkarlıq səviyyəsinin kadr hazırlığına təsiri məsələləri şərh olunur. Pedaqoji-psixoloji və metodiki bilikləri olmayan mühəndislərin pedaqoji fəaliyyətləri zamanı tədris prosesində yaranan problemlər və nəticədə onların keyfiyyətə təsiri məsələləri məqalədə öz əksini tapmışdır.

***Açar sözlər:*** *mühəndis-pedaqoji heyət, monitorinq, təhsil proqramı, metodika, beynəlxalq təcrübə.*

***Ключевые слова:*** *инженерно-педагогический состав, мониторинг, программа образования, методика, международная практика.*

***Key words:*** *engineers-teaching staff, monitoring, curriculum, methodics, international practice.*

İlk peşə-ixtisas təhsili sahəsində əsas məqamlardan biri də müəllimlərin keyfiyyət və peşəkarlıq səviyyəsidir. İşəgötürənlərin tam etibar etdiyi yüksək bacarıqlı və hazırlıqlı müəllim heyəti olmadan ixtisas çərçivəsinin və işəgötürənlərin ehtiyaclarına cavab verən, bilik və bacarıqlara əsaslanan tədris proqramlarının prosesə təsiri o qədər də böyük olmayacaqdır. İlk peşə-ixtisas təhsili müəssisələrinin (İPİTM) işəgötürənlərin mövcud və gələcək işçi qüvvəsinə olan ehtiyaclarını ödəmələri üçün özləri bu sahədə təşəbbüs irəli sürməli və öz heyətlərinin fasiləsiz peşə təhsilinə diqqət yetirməlidirlər.

İPİTM-də çalışan əksər ixtisas fənn müəllimləri və istehsalat təlimi ustaları müxtəlif texniki universitetləri və orta ixtisas təhsili müəssisələrini bitirmiş, müvafiq ixtisas qazanmışlar, lakin müəllimlik ixtisası üçün vacib olan müasir təlim-tədris metodologiyası üzrə bilik və bacarıqlara malik deyillər. Müəllimlər ilk peşə-ixtisas təhsilinin ehtiyaclarına uyğun hazırlanmış təhsil proqramı üzrə ilkin təhsil almadan İPİTM-lərdə işləməyə başlayırlar. Nəticədə, təhsilalanlara verilən təhsilin səviyyəsi aşağı olur və müəllimlər təhsilalanlarla münasibətlər qurmaqda çətinliklərlə üzləşirlər.

Azərbaycanda bir sıra ali təhsil müəssisələrində (Azərbaycan Texniki Universiteti, Azərbaycan Dövlət Neft və Sənaye Universiteti, Azərbaycan Aqrar Universiteti və b.) pedaqogika və psixologiya nə əsas, nə

də seçmə fənn kimi tədris edilir.

Bir sözlə, İPİTM-lərdə ixtisas fənn müəllimləri ali təhsilli, istehsalat təlimi ustaları isə ali və ya orta ixtisas təhsilli olsalar da, pedaqogika, psixologiya və tədris metodikası barədə baza təhsilinə malik deyillər. Onların böyük əksəriyyətinin İKT də daxil olmaqla, müasir tədris mühiti yaratmaq və bu mühiti inkişaf etdirmək üçün istifadə edilən metodlar üzrə baza təhsilləri yoxdur.

Təlim almış peşəkar müəllim hədəf auditoriya üçün ən uyğun yanaşmanı seçməyi bacarmalıdır. Mövcud sistemdə isə əsas diqqət hələ də tədris kabinetlərində mühazirələr vasitəsilə biliklərin ötürülməsinə və praktik dərslərin emalatxanalarda tədris edilməsinə yetirilir. Dərslərdə istifadə edilən metodologiya hədəf auditoriyanın ehtiyaclarını tam ödəmir.

Deyilənləri aşağıdakı kimi ümumiləşdirmək olar:

• İlk peşə-ixtisas təhsili sistemində müəllimlər hər 5 ildən bir təkmilləşmə kursları keçməlidirlər, lakin bu, yerlərdə tam yerinə yetirilmir. Bütün işçi heyətin (İPİT sistemində 3272 mühəndis-pedaqoji işçi çalışır) təlim keçməsi zəruri olsa da, maliyyə vəsaitinin kifayət qədər olmaması buna imkan vermir. Nəticədə, ildə 650 nəfərdən çox mühəndis-pedaqoji işçi təlim keçməli olduğu halda cəmi 200 nəfərə yaxın işçi təlim keçir.

• Təlim-tədris prosesində müəllimə yönəlmiş metodologiyadan istifadə edilib fəal pedaqogikaya (tədrisə interaktiv yanaşmaya) az müraciət edilir. Müəllimlərin kompüter otağından kənarda (əgər kompüter otağı varsa) istifadə etdiyi yeganə vəsait lövhə, təbaşir və ya adətən, aşağı səviyyədə təchiz olunmuş emalatxanalardır. Təlim-tədris prosesində İKT-dən istifadə aşağı səviyyədədir. İKT-dən, əsasən, informatika dərslərində və kompüter bacarıqlarının öyrədilməsi zamanı istifadə edilir.

• İş şəraiti və iş şərtlərinin qənaətbəxş olmaması səbəbindən yüksəksəviyyəli müəllim kadrları ilk peşə-ixtisas təhsili sahəsində çalışmağa həvəs göstərmirlər.

Müəllimlərin təkmilləşmə kursları hazırda daha çox göndəriş xarakteri daşıyır, yəni müəllimlər konkret kurslarda iştirak etməyə göndərilirlər. Onların özləri bu sahədə az təşəbbüs göstərirlər. Məhz bunların nəticəsidir ki, İPİTM-lərdə tədrisin keyfiyyəti çox vaxt günün tələblərinə cavab vermir, öyrədən təhsil standartında göstərilmiş səriştələri (kvalifikasiyanı) təhsilalana aşılaya bilmir. Təhsilin keyfiyyəti aşağı düşür.

İPİTM-lərdə təhsilin keyfiyyətini artırmaq üçün, ilk növbədə təhsilverənlərin keyfiyyət göstəricilərinin monitorinqi aparılmalıdır.

İlk peşə-ixtisas təhsili müəssisələrinin mühəndis-pedaqoji heyətinin (müəllimlərin və istehsalat təlimi ustalarının) fəaliyyətinin monitorinqi üçün təklif edilən meyarlar aşağıdakılardır:

• Müəllim və istehsalat təlimi ustalarının baza təhsili (ali, orta ixtisas, tam orta) və ixtisası üzrə iş stajı;

• müəllim və istehsalat təlimi ustalarının tədris etdiyi fənlərin (istehsalat təlimi ustalarının təhkim olunduğu qrupun) baza ixtisaslarına uyğunluğu;

• ixtisasları üzrə vaxtaşırı ixtisasartırma kursları və istehsalatda staj keçmələri;

• yeni işə qəbul olunmuş mühəndis-pedaqoji işçilər üçün pedaqogika, psixologiya və tədris metodikası üzrə müvafiq kursların təşkili;

• mühəndis-pedaqoji işçilərin yaş həddi;

• tədris yükünün mühəndis-pedaqoji işçilər arasında mövcud qaydalara uyğun bölgüsü və taarifləşdirilməsi;

• mühəndis-pedaqoji heyətin İKT, xarici dil bacarıqları;

• mühəndis-pedaqoji heyətin təhsilalanlar

və həmkarları ilə ünsiyyət qurmaq (kommunikasiya) bacarıqları;

• mühəndis-pedaqoji heyətin müasir tədris mühiti yaratmaq və bu mühiti inkişaf etdirmək bacarıqları.

Dərslərdə:

• dərsə hazırlıq (sanitar-gigiyena tələbləri, şagirdlərin hazırlığı);

• dərsin məqsədi və mövzusu;

• dərsin tipi və strukturu;

• standartların düzgün seçilməsi;

• məqsədin standarta uyğunluğu;

• fəndaxili inteqrasiya;

• motivasiyanın məqsədə uyğun qoyulması;

• tədqiqat sualının təlim məqsədinə uyğunluğu;

• məlumatın müzakirəsinin təşkili;

• ümumiləşdirmə və nəticə;

• məqsədin məzmun standartına uyğunluğu;

• pedaqoji prosesin tamlığı;

• dərsin əsas mərhələlərinin müəyyənləşdirilməsi;

• hər bir mərhələdə müəllim və şagirdlərin fəaliyyət növü, ardıcıllığı və məqsədəuyğunluğu;

• hər bir mərhələ üçün seçilmiş forma, üsul və tədris resurslarının məqsədəuyğunluğu və məhsuldarlığı;

• hər bir mərhələyə ayrılmış vaxt və onun səmərəli paylanması;

• dərsin birinci mərhələsindən sonuncu mərhələsinədək şagirdlərin təlim fəaliyyətinin inkişaf dinamikası;

• dərsin ayrı-ayrı mərhələlərində qarşılıqlı əlaqələrin yaradılması;

• dərsdə nəticə olaraq şagirdlərin əldə etdikləri bilik və bacarıqların mənimsədilməsində (təlim nəticələrinin reallaşmasında) hər bir mərhələnin rolu;

• təlim metodları;

• öyrədici fəaliyyətin təşkili formaları;

• biliklərin yeni şəraitdə tətbiqi;

• motivasiya və stimullaşdırma;

• müstəqil iş;

• biliyin yoxlanılması və qiymətləndirilmə səviyyəsi;

• psixoloji mühit;

• ev tapşırığı;

• şagirdlərin öyrənmə fəallığının səviyyəsi;

• şagirdlərin ümumtəhsil, peşə bacarıqları və vərdişlərinin formalaşdırılması;

• təlimin təhsilləndirici, inkişafetdirici və tərbiyəedici vəzifələrinin reallaşdırılması və s.

Bu sahədə beynəlxalq təcrübədən yeri gəldikcə istifadə edərək işi bir qədər də yaxşılaşdırmaq olar. Belə ki, Birləşmiş Krallığın Peşə Təhsili Sənədində TPT (texniki peşə təhsili) sahəsində işçi qüvvəsinin peşəkar səviyyəsini artırmaq üçün yeni qaydaların həyata keçirilməsinə başlanmışdır. Buraya müəllimlərin fənn üzrə müasir biliklərə, tədris və pedaqoji bacarıqlara malik olmasını təmin etmək üçün onların peşəkarlıq sertifikatlarının olması və fasiləsiz peşə təhsili (FPT) üzrə minimum tələblərin qoyulması daxildir. Bu qaydalar peşə təhsilinin işçi heyəti sahəsində islahatlar aparılması prosesinin bir hissəsidir. Bu islahatlar TPT üzrə Milli İnkişaf Strategiyası üzrə aparılmış bilik və bacarıqların təhlili (dünya iqtisadiyyatında hamı üçün inkişaf – dünyada yüksək səviyyəli bacarıqlar - “Prosperity for all in the global economy - world class skills”) və 2005-ci ildə qəbul edilmiş 14-19 yaşlı gənclər üçün Təhsil və Bacarıqlar üzrə Sənədlə uyğunluq təşkil edir.

Sonrakı təhsil üzrə müəllimlərin fasiləsiz peşə təhsili və sertifikatlaşması (İngiltərə) qaydaları yalnız ali təhsil verən müəllimləri çıxmaqla bütün müəllimlərə aiddir. Bu qaydalara aşağıdakılar daxildir:

- Müəllimlərin tədris etdikləri fənlər üzrə bilik və bacarıqlarının artırılması, peşəkarlıq səviyyələrinin davamlı yüksəl-dilməsi üçün tam ştatda olan müəllimlər ildə ən azı 30 saat FPT keçməlidirlər;

- yarımştatda olan müəllimlər ildə ən azı 6 saat olmaqla müvafiq sayda FPT keçməli və birdən artıq PTM-də işləyən müəllimlər FPT ilə bağlı tələbi uyğun olaraq yerinə yetirməlidirlər;

- peşə təhsili müəssisələri müəllimləri keçdikləri FPT üzrə qeydlər aparmalı, həmin qeydləri hər il öz işəgötürənlərinə və tədris institutuna təqdim etməlidirlər;

- peşə təhsili müəssisələri müəllimlərinin fənn tədris etmələri üzrə peşəkarlıq səviyyələri peşə təhsili sektoru üzrə professional qurum olan təhsil institutu tərəfindən təsdiq olunur.

Qeyd etmək lazımdır ki, təhsil institutu peşə təhsili və bacarıqları sahəsində müəllimlər və təlimçilər üçün peşəkar qurumdur. Onun məqsədi TPT sektorunda müəllim heyətinin statusunu yüksəltməkdir.

Nümunə olaraq Avropa İttifaqına ən son üzv olmuş dövlətlərdən biri - Rumıniya götürülmüşdür. Rumıniyada TPT (texniki peşə təhsili) sahəsində islahatlar aparılaraq kurikulumlarda, təlim və tədris prosesində, maddi-texniki bazada və işəgötürənlərlə əlaqələr sahəsində dəyişikliklər edilmişdir. TPT heyətinin işəgötürənlərin ehtiyaclarına uyğun yeni bilik və bacarıqlar əldə etməsi məqsədilə onlar üçün fasiləsiz peşə təhsili proqramları həyata keçirilir. Təhsil, Tədqiqat və İnnovasiya Nazirliyi müəllimlərin mövcud təcrübəsindən istifadə etməyi və fasiləsiz peşə təhsili üçün gələcək imkanlar yaratmağı qarşısına məqsəd qoymuşdur.

Rumıniyanın ixtisas çərçivəsi əmək bazarının ehtiyaclarına uyğun tərtib edilmişdir. Nəticədə, bir sıra müəllimlərin yeni kvalifikasiyaya ehtiyacı olduğu müəyyən edilmişdir.

Son illərdə Rumıniyada aşağıda qeyd edilmiş bir sıra tədbirlər həyata keçirilmişdir:

• Ehtiyac olan sahələrdə müəllimlərin ikinci ixtisas qazanmaları üçün onlara təlim keçilməsi, həmçinin TPT sahəsində işçilərin ixtisar edilməsinin qarşısını almaq məqsədini daşıyır.

• TPT heyətinin bilik və bacarıqlarını yeni pedaqoji və metodoloji bacarıqlara və işəgötürənlərin tələblərinə uyğunlaşdırmaq üçün ilkin olaraq Rumıniyanın Qərb Regionunda TPT heyəti üzrə adambaşına ildə 20 saat fasiləsiz peşə təhsili müəyyən edilmişdir.

• “Texniki peşə təhsili sahəsinin tərəfdaşları” sırasına məktəblər, vilayət məktəblərinin nəzarət şuraları, universitetlər, yaşlıların təlim mərkəzləri, müəllimlərin təlim mərkəzləri və işəgö-türənlər daxil edilmişdir.

Yüksək keyfiyyətli təhsilin əsasını yüksək səviyyəli müəllim-pedaqoji heyəti təşkil edir. Almaniya Federativ Respublikasında müəllim hazırlığına xüsusi diqqət yetirilir. Müəllim hazırlığı uzun bir proses olmaqla müəllimlərin həm ixtisas üzrə lazımi biliklərə, həm də pedaqoji və didaktik biliklərə sahib olmalarını təmin edir.

Almaniya Federativ Respublikasında müəllim hazırlığı, əsasən, 2 pilləli formada həyata keçirilir - nəzəri biliklərin verildiyi ali təhsil pilləsi və praktiki bacarıqların əldə edildiyi müəllim hazırlığı proqramı. Müəllim hazırlığının ilkin mərhələsi ali təhsil müəssisələrində xüsusi tədris pillələrində aparılır. Hər bir təhsil növü üçün ali təhsil müəssisələrində ayrıca tədris pilləsi təklif edilir. Belə ki, gələcək müəllimlər ali təhsil müəssisələrində ixtisas və pedaqoji-praktik biliklərə yiyələnirlər. Müəllim hazırlığının ikinci hissəsi isə referendariat (hazırlıq proqramı) adlandırılan xüsusi hazırlıq prosesi ilə davam etdirilir.

Almaniya Federal Təhsil Nazirliyinin konfransında müəllimlərin yiyələnməli kompetensiyaları və cavabdeh olduqları sahələr belə müəyənləşdirilmişdir:

- Müəllim dərs və tərbiyə prosesinin

aparılmasına cavabdehdir, qiymətləndirmə işlərini həyata keçirməli və innovasiyalara meyilli olmalıdırlar.

- Müəllimlər ali təhsil müəssisələrində aldıqları ilkin təhsildən sonra aşağıdakı kompetensiyalara sahib olmalıdırlar:

- lazımi səviyyədə ixtisas biliklərinə;
- fənlər üzrə işləmə metodlarına;
- lazımi səviyyədə ixtisas didaktikasına.

Müəllim hazırlığı proqramında isə əldə edilmiş biliklər daha da dərinləşdirilir, pedaqoji biliklərlə tamamlanır. Bu hazırlıq prosesindən sonra müəllimlər aşağıdakı kompetensiyalara yiyələnmiş olurlar:

- İxtisas üzrə təhsil prosesini planlaşdırmaq və həyata keçirmək;
- tədris prosesinin kompleksliyini qiymətləndirmək və problemləri həll etmək;
- təhsilin davamlılığını təmin etmək;
- ixtisas üzrə təhsil nəticələrini qiymətləndirmək.

Beləliklə, müəllim hazırlığı 4 kompetensiya sahəsini - ixtisas üzrə bilikləri, ixtisas didaktikasını, təlim-tərbiyə elmlərini və məktəb praktikasını əhatə edir.

***Rəyçi: dos. R.Qəndilov***

## İstifadə edilmiş ədəbiyyat

1. Modul milli kurikulumlar və ilk peşə ixtisas təhsili. Bakı: Mütərcim, 2015.

2. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu). Bakı, 2006.

3. “Azərbaycan Respublikasında Məşğulluq Strategiyası (2005-2006-cı illər)”. Bakı, 2005.

4. Azərbaycan Respublikasında texniki peşə təhsilinin inkişafı üzrə Dövlət Proqramı (2007-2012-ci illər)”. Bakı, 2007.

5. Рамазанов А., Аскеров Р. и др. Профессиональное образование и обучение на Южном Кафказе: на пути от выживания к эффективному функционированию национальных систем. Баку, 2008.

**Р.Аскеров,**
**М.Курбанов**

**Задачи мониторинга инженерно-педагогического состава, действующих первых профессионально-технических образовательных учреждениях**

**Резюме**

В статье рассматриваются задачи влияния уровня професиональности и качества инженерно-педагогического состава в подготовке кадров, работающих в учреждениях профессионального образования.

**R.Askerov,**
**M.Gurbanov**

**The issues of monitoring of engineering-pedagogical staff teaching at initial vocational education institutions**

**Summary**

This article is about pedagogical staff’s qualification effect to training of personnel. In this article has written about engineers without pedagogical, physchological and methodical knowledge. Here is also spoken about problems and in conclusion its effect to qualification. For increasing qulity of education firstly should take monitoring process. This article has just dedicated to this criterion.



# MƏNƏVİ TƏKAMÜLÜN TÜRK QAYNAQLARI

**Buludxan Xəlilov,**
***filologiya üzrə elmlər doktoru, professor***

***Açar sözlər:*** *sivilizasiya, hikmət xəzinəsi, Şərq müdrikliyi, düşüncə tərzi.*
***Ключевые слова:*** *цивилизация, мудрость богатство, Восточная мудрость, образ мышления.*
***Key words:*** *civilization, wisdom wealth, Eastern wisdom, way of thinking.*

Əhməd Yəsəvi Türküstan ellərində doğan bir türk günəşidir. O, təbiəti və fəaliyyəti ilə yüz minlərlə insanın qəlbində işıqlı fikirlər oyadan, bütün insanlara məhəbbətlə yanaşan şəxsiyyət olmuşdur.

Əhməd Yəsəvi türk dili və türk sözünə qiymət verməyi bacaran, faydalı danışmağı, yaxşı söz söyləməyi nəsillərə tövsiyə edən, bilikli, mədəni şəxslərin məziyyətlərini yüksək dəyərləndirən, təhsil və tərbiyənin mahiyyətini düzgün dərk edən, irəli sürdüyü orijinal fikirləri ilə Şərq tarixini zənginləşdirən ən böyük şəxsiyyətlərdəndir.

O, yaşadığı bir peyğəmbər ömründə öz elmi, bədii əsərləri ilə orta əsrlər Şərqində mənəvi təkamülün sürətləndirilməsinə təsir göstərən, bütün bəşəriyyət üçün əhəmiyyət kəsb edən mədəniyyət abidələri yaratmağa müvəffəq olmuşdur. Əhməd Yəsəvinin bədii düşüncəsinin nailiyyəti olan şeirləri "hikmət" adı ilə türk ədəbiyyatının, o cümlədən türk təsəvvüf şeirinin ən əski nümunələri səviyyəsinə ucalmışdır. Onun "Divani-hikmət" adlı didaktik əsəri daha geniş şöhrət qazanmışdır. Türkün ölməz abidəsi olan bu kitabı başqalarından fərqləndirən əsas keyfiyyət üstünlüyü ondadır ki, bu didaktik əsər Qaraxanlı türkcəsi ilə, həm də bu türkcənin xaqaniyyə ləhcəsində, türklərin anlayacağı tərzdə yazılmışdır.

Əhməd Yəsəvinin "Divani-hikmət"ində toplanmış hikmətlərin bir qismi onun özünün yazdığıdırsa, digərləri onun adından təriqət tərəfdarlarının yazdıqlarıdır. Əsər başdan-başa tərbiyəvi söhbət və nəsihətlərlə doludur. Şərq müdrikləri öz yazılarında bu əsərə dönə-dönə müraciət etmişlər. Böyük sənətkarlıqla yazılmış əsər bu gün də öz tərbiyəvi əhəmiyyətini itirməmişdir.

Türk dünyasında belə hesab olunur ki, "Divani-hikmət"in elm aləminə məlum olan ən qədim yazılı variantı XVIII əsrdən əvvələ getmir. Belə hallar digər Şərq abidələrinə də şamil olunur. Məsələn, "Oğuznamə"nin XVI əsrin sonunda, yaxud XVII əsrin əvvəllərində qələmə alındığı güman edilsə də, əslində buradakı atalar sözü və məsəllərin böyük əksəriyyəti IX-XI əsrlərə aiddir.

Əhməd Yəsəvi bu əsəri ilə elm, mədəniyyət dünyasında türkcəni daha yüksəkliklərə qaldırmağa müvəffəq olmuşdur. O, fars dilini mükəmməl bilməsinə baxmayaraq, türk dilinə üstünlük vermiş və farscanın meydan aldığı dövrdə isə yenə də türkcənin imkanlarına söykənmişdir.

Əhməd Yəsəvi Yəsədə irşada başladığı vaxt Türküstanda güclü bir İslamlaşma cərəyanı və İslam ölkələrinin hər birində geniş yayılmış təsəvvüf cərəyanı mövcud olmuşdur. O özü də bu cərəyanlara təsir göstərən şəxsiyyətlər olmuşdur.

Əhməd Yəsəvinin doğum tarixi dəqiq şəkildə bilinmir, belə hesab olunur ki, o, XII əsrin əvvəllərində (1103 və ya 1105-ci

illərdə) dünyaya gəlmişdir.

Əhməd Yəsəvinin atası Sayramın tanınmış adamlarından olub, adı Şeyx İbrahim olmuşdur. Şeyx İbrahim Həzrəti-Əlinin nəslindən olan bir kişi kimi tanınmışdır. Anası Şeyx İbrahimin xəlifələrindən biri olan Musa Şeyxin qızı Ayişə xatundur. Əhməd Şeyx İbrahimin Gövhər Şahnaz adlı qızından sonra dünyaya gələn ikinci övladı idi. O, əvvəl anasını, sonra da atasını itirmiş və bacısı ilə birlikdə yetimliklə böyümüşdür. Əhməd yeddi yaşından atasız-anasız qalmışdır.

Elə bu yaşlarında məlum olmayan səbəbdən bacısı ilə birlikdə Yəsəyə gəlmişdir. O zaman Yəsədə Arslan Baba adlı bir türk şeyxinin təmsil etdiyi və yaydığı təsəvvüf ənənəsi mövcud idi.

Əhməd ilk təhsilini Yəsədə almış və yaşca kiçik olmasına baxmayaraq, gözlənilməyən qeyri-adiliklər göstərməklə bütün ətrafının diqqətini özünə çəkmişdir. Əhməd Yəsəvi güclü mədrəsə təhsili almış, dini elmləri dərindən öyrənmiş, təsəvvüfün bütün sirlərini mənimsəmişdir. O, öyrəndiklərinin hamısını aydın, anlaşıqlı və sadə bir dildə (türk dilində) ətrafında olan insanlara anlatmağa çalışmışdır. Onun əsas məqsədi İslam dinini türklərə sevdirmək və əhli-sünnət əqidəsini yaymaq olmuşdur.

Əhməd Yəsəvinin İbrahim adlı bir oğlu olmuş, lakin hələ özünün sağlığında uşaq vəfat etmişdir. Bundan başqa, onun Gövhər Şahnaz və Gövhər Xoşnaz adında iki qızı olmuşdur. Türküstanın, Orta Asiyanın müxtəlif bölgələrində, həm də Anadoluda özlərini Əhməd Yəsəvinin nəslindən sayanlar hazırda da az deyildir. Orada Yəsəvi adına və nəslinə indi də hörmətlə yanaşılır.

Türkün bədii düşüncə tərzinə erkən yiyələnmiş Əhməd Daşkənd və Sırdərya ərazisində, Ceyhunun qarşısındakı çöllərdə yaşayan köçəri türklər arasında güclü nüfuz sahibi olmuşdur. Onun ətrafında toplaşanlar İslam dininin əsaslarını, şəriəti, təriqəti, ədəb və ərkanı öyrənirdilər. İstedadlı Əhməd hələ kiçik yaşlarından sadə bir dillə heca vəznində mənzumələr – şeirlər söyləmişdir. O dövrdə mənzumələr – şeirlər söyləyənlər çox idi. Ona görə də o öz mənzumələrini – şeirlərini digərlərindən fərqləndirmək üçün onlara “hikmət” adını vermişdir. İstər sənətkarlıq, istərsə də mənaca başqalarından seçilən bu mənzumələr, şeirlər dərvişlər vasitəsilə türklərin yaşadığı ən uzaq yerlərə qədər çatdırılır, bu “hikmətlər” qəlblərə hakim olurdu. Əlbəttə, onun hikmətləri sadəcə oxunmurdu, həm də bunlar türklər arasında düşüncə birliyinin təşəkkül tapmasına xeyli dərəcədə xidmət göstərirdi. Bilikli, savadlı adamların simasında dilə, sözə həmişə yüksək qiymət verilib, sözlə yüksəlişin faydası öyülüb və təriflənibdir. Təsadüfi deyildir ki, atalar yaxşı demişdir: “Başa dil gətirəni, el yığışsa gətirə bilməz”, “Qılınc yarası sağalar, dil yarası sağalmaz” atalar sözləri və onun “Oğuznamə”də işlənmiş “Qılıç yarası önəlür, dil yarası önəlməz” paraleli türkün yaddaşında yenidən qaynaqlanırdı. Bütün bunlar türk babalarımızın dilə verdiyi dəyərin nə qədər əhəmiyyətli olduğunu bir daha təsdiqləyir. Müdriklər dönə-dönə təkrar edirdi ki, dilin altında insanın kimliyi gizlənir. Dilin altında insanın dünyagörüşü, ətrafdakılara münasibəti gizlənir. Dilin altında dilin öz imkanları gizlənir. Ən nəhayət, dilin altında dünyada dərk olunan və dərk olunmayan nə varsa, onların hamısı gizlənir. Maraqlıdır ki, bu barədə türkün yaratdıqları daha tutarlı sözlərdən istifadə olunurdu. O kəlamlar ağızlarda, dillərdə gəzirdi.

Əhməd Yəsəvi öz dəyərli fikirləri ilə türk biliyi, idrakı və ağılı vəhdətdə götürməklə kamilliyin nə olduğunu anlatmağa çalışırdı. O da həqiqətdir ki, bilik, idrak və ağıl həmişə kamilliyə xidmət etmişdir. Nəticədə isə kamil olan hər bir kəs insan ola-

raq əbədi olmasa da, adı əbədi yaşamışdır. İnsan dünyaya bilik, idrak və ağılla hakim olmuşdur. Türk babalarımız biliyin, idrakın və ağılın kara gəlmədiyi vaxt qılıncın oynadığı rolu da gizlətməmişdir. Onu da qeyd edək ki, Əhməd Yəsəvinin şöhrəti bütün türk ölkələrinə yayıldıqca Yəsəvilik də bir təriqət kimi məşhurlaşırdı.

Əhməd Yəsəvinin hər nəzm parçasında dərin bir həyat fəlsəfəsi vardır. Məlumdur ki, Şərq-islam fəlsəfəsi bir-biri ilə sintez olunmuş fəlsəfədir. Bu cür sintez türk və şərq aləmində həyata, məişətə, dünyagörüşə də şamil edilir. Böyük filosofun didaktik fikirləri tərbiyə sisteminə də təsirsiz qalmırdı. Təsadüfi deyildir ki, onun pedaqoji görüşlərinə dair çoxlu araşdırmalar aparılmışdır. Yəsəvinin adı pedaqoji antologiyalara salınmışdır. Yeri gəlmişkən onu da qeyd edək ki, Əhməd Yəsəvinin ərəb, fars, təbii ki, türk dillərini bilməsi, türkə, şərqə aid olan bütün incəliklərə, dərinliklərə bələd olması onun dünyagörüşündə türkə və şərqə aid bütün dəyərləri sintez edə bilmişdir. Odur ki, o, türk və şərq adamı kimi düşünmüş, dini, mədəni-mənəvi dəyərləri özünün həyat fəaliyyətinə və əməlinə çevirə bilmişdir. O da sələfləri və müasirləri kimi düşünürdü ki, bilik, elm, idrak, ağıl sahibi olmaq dünyada hər şeydən üstündür. Bunların hər biri insanın dostu, köməyi və arxasıdır, eyni zamanda dövlətdən, vardan qat-qat qiymətlidir. Təbiidir ki, dünyada bilikli, elmli, idraklı, ağıllı adamlara həmişə ehtiyac olmuşdur. Bu fikirlər Nizamül-mülkün "Siyasətnamə" əsərində də öz əksini tapmışdır: "Sultanların ən yaxşısı odur ki, elm adamı ilə oturub-dura, alimlərin ən pisi odur ki, soltanla durub-otura". Burada Loğmanın dili ilə deyilmiş fikir istinad kimi götürülür: "Dünyada insan üçün elmdən daha yaxşı dost yoxdur. Elm dövlətdən də yaxşıdır, çünki dövləti sən saxlamalısan, elm isə səni saxlayır". Bundan başqa, VII-VIII əsrin görkəmli üləmalarından biri olan Həsən Bəsrinin fikrinə istinad olunur: "Alim o deyildir ki, ərəbcə çox bilib, qəliz ərəb ifadələrini və sözlərini çox əzbərləmiş olsun, alim odur ki, bütün elmlərdən başı çıxsın, hansı dili bilsə, məqbul sayılar". Daha sonra "Siyasətnamə"də yazılır: "Əgər bir adam şəriətin bütün qanunlarını, Quranın təfsirini türk, fars və rum dilində bilir, ərəb dilini bilmirsə, alim sayılar. Lakin ərəbcə də bilsə, daha yaxşı olar".

Bir sözlə, Əhməd Yəsəvi türkün və şərqin ən böyük şəxsiyyətlərindən biri kimi nəhəng Şərq müdrikləri arasında öncül yerlərdən birini tutur. O, həm türk dünyası, həm də şərq aləminə dair dərin məlumata malik olmuşdur. Türk geniş mənada qonşuluq münasibətini millətlər, xalqlar, dövlətlər arasında olan münasibət kimi anlamış və bu zaman məsələyə elat düşüncə tərzi ilə deyil, milli-siyasi və dövlətçilik düşüncə tərzi ilə yanaşmışdır. Hələ ən qədim, qədim və orta əsrlər mərhələsində türk başqa xalqlarla milli-siyasi, dövlətçilik düşüncə tərzi ilə qonşuluq münasibətində olmuşdur.

İdrak sahibləri dövlətçilik düşüncəsinə sadiq qalmaqla dövləti idarə edən hər bir kəsin faydalanacağı öyüd və nəsihətlərlə türkün dövlətçilik tarixinin qədimliyini təsdiq etmişlər. Hələ orta əsrlərdə dövlətin (məhz türk dövlətinin) müasir anlamda desək, konstitusiyasını yazmaq, hökmdarın, vəzirin, bəyin, sərkərdənin, katibin, xəzinədarın, aşpazın, xidmətçinin necə olmasını ölçüyə, meyara çevirmək, eyni zamanda alimlərə, təbiblərə, əfsunçulara, yuxu yozanlara, münəccimlərə, şairlərə, əkinçilərə, satıcılara, heyvandarlara, sənətkarlara, yoxsullara münasibəti ədalətli, cəmiyyətin hər bir təbəqəsinin marağı təmin olunmuş şəkildə bəyan etmək dövlətçilik təcrübəsinin məhsulu kimi başa düşülməlidir. Həm də türklərin qurduqları yüzlərlə, minlərlə dövlətlərin idarə olunması zamanı idarəçilik

təcrübəsinin diktə etdiyi öyüd-nəsihətlər kimi qəbul olunmalıdır.

Dünyada çoxlu dövlətlər qurulub, yaşayıb və dağılıbdır. Türklərin yaratdıqları saysız-hesabsız dövlətlər yaşayıb, dağılıb və yeniləri ilə əvəz olunubdur. İmperiyalar da belə olubdur. Ancaq dövlətin əbədi olması üçün gərəkli olanlar vardır. Ona görə də türk və şərq təcrübəsini sintez edərək fikirlərini hikmətə çevirməyi bacarmışdır. Dövlətin öz xoşbəxtliyinə qovuşması üçün onun bilikli, fəzilətli, adil bir hökmdarı olması ilə yanaşı, səadət və xoşbəxtlik gətirən vəziri, aqilləri, müdrikləri və qənaətcilliyin, gözütoxluluğun nədən ibarət olduğunu anlaya bilən cəmiyyəti mütləqdir. Türkün dövlətçilik düşüncəsində qeyd olunan bu cəhətlər dövləti və cəmiyyəti xoşbəxtliyə apara bilər.

Bilikli adamların dilə verdiyi qiymət, daha doğrusu, dilin başa gətirdikləri XI-XII yüzilliyin görkəmli türk ədəbi simalarından olan Əhməd Yügnəkinin yaradıcılığında da poetik vəsfini tapmışdır.

Türkün hikmət xəzinəsi övlad məhəbbətindən – ata-oğul, ata-qız, ana-oğul, ana-qız münasibətlərinin təcrübəsindən çıxmış, möhür kimi dil nümunələrinə öz damğasını vurmuşdur. Övladın tərbiyəsi həm də, məhz sağlam tərbiyəsi, uşaqların ədəbli olması türk babalarımızın həyat tərzinin ən mühüm məziyyətlərindən biri olmuşdur. Türk babalarımızı hələ təlim və tərbiyədən əvvəl oğul-qıza bilik və ədəb öyrədən süd anasının kimliyi maraqlandırmışdır. Əsil, nəsəb türk müdriklərini həmişə düşündürmüşdür.

Yaş dövrünün elmi ədəbiyyatlardakı təsnifatına qədər ayrı-ayrı aqillər, müdriklər, hikmət sahibləri yaşların xarakterik məqamları barəsində öz fikir və mülahizələrini söyləmişlər. Bu mənada türkün hikmət xəzinəsində hər yaşın qədrini bilməklə yanaşı, həmin yaşın insana nə verdiyi barədə fikirlər də mövcuddur.

Əhməd Yəsəvi alimlərin sözünü dinləmək, onların xidmətində dayanmaq barəsində də yazır. Onu da qeyd edək ki, türkün hikmət xəzinələrində bütün yaşlara deyil, onların bir qisminə idrak sahibləri tərəfindən münasibətləri də bildirilmişdir. Bu münasibət, təbii ki, dərin müşahidə, yaşam tərzi, təcrübə əsasında baş vermişdir. Məsələn, Yusif Balasaqunlunun “Qutadqu bilik” əsərində gəncliyə və qocalığa münasibətlə yanaşı, həm də otuz, qırx, əlli, altmış yaşlara, belə demək olarsa, lazımi qiymət verilmişdir. Gənclik barəsində belə dəyərli fikirlər söylənmiş, öyüd-nəsihət verilmişdir.

Bu mənada bizim Azərbaycan atalar sözləri də milli təfəkkür inciləri kimi müdriklik xəzinəsinə daxil olmuşdur. Bunun bir səbəbi onun istedadı və bacarığı idisə, digər səbəbi türk və şərq aləmi ilə əlaqəli bilgi sahibi, idrak sahibi, kamil insan olması ilə izah olunmasıdır.

Türkün hikmət xəzinəsində əsl insana yüksək qiymət verilmiş, onların zəmanəyə, dünyaya hakim olmaları söylənilmiş, belələrinə bənzəmək təbliğ olunmuşdur. Əsl insan ağlı sayəsində əsl insan adlandırılmışdır. Əsl insanın ağıllı, əsilli və nəcib olduğu söylənilmişdir.

Alim, elm adamları barəsində fikirlər Əhməd Yəsəvinin hikmətlərində də özünə yer alıbdır. Əhməd Yəsəvi elm adamları, alimlər barəsində fikrini açıqlayaraq qeyd etmişdir ki, təkcə kitab oxuyan adam, kitab oxumaqla özünü başqalarından üstün hesab edən adam, özünü təkəbbürlü aparan adam alim deyildir. Əhməd Yəsəviyə görə, alim şəriət, təriqət, həqiqət elmini bilməlidir. Onun fikrincə, hər bir kəs belə alimlərə hörmətlə yanaşmalı, onların sözlərini dinləməli, məsləhətlərinə qulaq asmalıdır.

Əhməd Yəsəvi haqqı tapmaqla öz canını, ruhunu ən qiymətli daş-qaş, mənbə, ocaq sayırdı. O da maraqlıdır ki, o hər yeri özünün məkanı bilsə də, özünü məkansız

sayırdı. Bununla o, bir daha Allaha yaxın olduğunu bəyan edirdi. O özünü məkansız saymaqla heç bir məkanın sahibi, yiyəsi olmadığını da söyləyirdi. Nəsimi də insanın məkansız gövhər olduğunu deyirdi. Ancaq hər bir şeyin, məkanın sahibi, yiyəsi kimi Allahı tanıyırdı. Yəsəviyə görə, yaradan bir qüvvə kimi hər şeyin, o cümlədən məkanın sahibidir, yiyəsidir. Sufilərə gəldikdə isə onlar Allahın yaratdığı hər bir şeyin sahibi, yiyəsi deyillər. Bununla da onlar Allahın böyüklüyünü, şəriksizliyini, təkliyini qəbul edərək ona yaxınlaşırlar, özlərini Allaha və onun qüdrətinə borclu sayırlar. Müqəddəs fikirləri ilə həmyerlilərinin qəlbində qığılcımlar oyadan Yəsəvinin böyüklüyünü qəbul edirlər. Bundan başqa, Allah hər bir şeyi yaradandır, onlar isə heç bir şeyi yaratmayıblar. Onlar sadəcə olaraq yaradana – Allaha yaxın olmağa can atan sufilər, təriqət adamlarıdır.

Böyük sərkərdə Əmir Teymur (1336-1405) onun qəbri üzərində türbə tikdirmişdir. Bu da təsadüfi olmamışdır. Belə ki, bir səfər ərəfəsində Əhməd Yəsəvi Teymurun yuxusuna girmiş və onun döyüşlərdə zəfər qazanacağını bildirmişdir. Teymur zəfərə yetişdikdən sonra (1396-1397) Əhməd Yəsəvinin qəbrini ziyarət etmək üçün Yəsəyə gəlmiş və ziyarətdən sonra qəbrin üstündə həmin türbənin tikilməsini qərarlaşdırmışdır. Dövrünün memarlığı baxımından fərqlənən türbə iki il ərzində tikilib sona yetirilmişdir. Bəzi rəvayətə görə, bu türbə sonralar özbək xanı Abdulla Xan tərəfindən, bəzi ehtimallara görə, Şeybani Xan tərəfindən əsaslı şəkildə təmir olunmuşdur.

Əhməd Yəsəvinin türbəsi türkmənlərin, özbəklərin, qazaxların, qırğızların ən müqəddəs ziyarətgahı olmuşdur. İndi də bu türbədə ibadətlə məşğul olurlar.

Orta Asiyanın çöllərində yaşayan türklərin öldükdən sonra Əhməd Yəsəvinin türbəsi yanında, ətrafında dəfn olunması xüsusi önəm daşımışdır. Hələ sağ olarkən bu türbənin ətrafında özünə qəbir yeri alanlar da az olmamışdır. Belə bir ənənə də vardır ki, qışda vəfat edənlər keçənin içində ağaca asılır və bahara qədər dəfn olunmur. Bahar gəldikdə isə, Əhməd Yəsəvinin türbəsi ətrafında dəfn olunurdular.

Yəsəvinin dövründə türk dünyasına ədəbiyyat və elm dilləri kimi fars və ərəb dilləri işlənirdi, bu dillərdə təhsil almayanların, bu dilləri bilməyənlərin İslam dininə daha dərindən bələd olması mümkün deyildi. Ona görə də ərəb və fars dillərini bilməyən köçəri və oturaq türklər arasında İslam dini bəzən təhrif olunmuş şəkildə təbliğ olunurdu. Bunları nəzərə alan Xoca Əhməd Yəsəvi xalqa dinimizi və onun mahiyyətini sadə xalq dilində təbliğ etməyə başladı. Şirin və cazibəli təbliği, yəni Yəsəvinin dini söhbətlərinə qulaq asmaq, onu dinləmək üçün bütün Türküstandan Yəsəvinin yanına gəlməyə, ömürlərində bir dəfə də olsun onun şirin dini söhbətlərini eşitməyə can atırdılar. Bütün bunların sirləri nə ilə izah olunmalıdır. Məlumdur ki, türk kimi poetik şəkildə fikir söyləmək təkcə bədii təfəkkür tərzinə malik olmaqla kifayətlənmir, həm də ən azı təbiətin özü qədər qədim olmağı, hissiyyatlı və emosional olmağı, qavrayış və düşüncə dərinliyinə malik olmağı, həyatı həyat kimi yaşamağı, həyatın və təbiətin dilini bilmək bacarığını, ruhlu olmağı, obrazlı danışmaq qabiliyyətini, ən başlıcası dil və təfəkkür qədimliyini tələb edir. Elə bunun nəticəsidir ki, türkün folkloru da, dili də, məişəti də, mədəniyyəti də, etnoqrafiyası da günəş kimi hərarətli, su kimi dupdurudur. Türkün folklorunun gücünü, təsir qüvvəsini həyatın, zamanın konkret məqamında, çətin və asan şəraitdə hiss etməli olursan. Türkün bədii düşüncə tərzi o qədər dərin və rəngarəng olmuşdur ki, onun dilindəki sözlər ən azı dualist, sonralar

çoxmənalılıq məzmunu kəsb etmişdir. “Türkün sözü”, “türkün məsəli” ifadəsi də buradan yaranmış, dualist xarakterli atalar sözləri və məsəllər də buradan köklənmişdir.

Türküstanın mürşidlərinin böyüyü, ağsaqqalı və xalq arasında “Piri-Türküstan” adı ilə tanınan Əhməd Yəsəvi hələ uşaqlığından Həzrəti-Peyğəmbərimizin həyat tərzinə, yaşantısına bütün varlığı ilə bağlanmış və ömrünü islamın saflığının qorunmasına, bu uca dinin əsri-səadət dövründə dünyada yaşamasına sərf etmişdi.

Əhməd Yəsəvinin hikmətləri onun vəfatından sonra da dillər əzbəri olmuşdur. Rəvayətə görə, onun Türküstanın hər tərəfinə yayılan doxsan doqquz min müridi, on iki min kamil təsəvvüf əhli (sufi), özünün sağ olarkən təyin etdiyi bir çox xəlifələri olmuşdur.

Əhməd Yəsəvi ömrünün 63 ili barədə hikmətlər vasitəsilə xeyli məlumat verir. Əhməd Yəsəvi yaşlanan insanların hər yaşının üstünə yaş gəlməsini onlara verilən imtiyaz, bəraət, təltif kimi qiymətləndirir. Eyni zamanda yetmiş, səksən, doxsan yaşa çatanların günahını yox etməyi, onların günahlarının bağışlanmasını istəyir. Burada o, adi insan kimi deyil, təriqət adamı kimi, Yəsəvi təriqətinin yaradıcısı kimi öz mövqeyini nümayiş etdirir.

Xoca Əhməd Yəsəvinin şah əsəri olan “Divani-hikmət”də deyilən didaktik fikirlər sadə türklərin hamısının anladığı və başa düşdüyü xalq dilində yazılıb. Bu mənzumələr türkləri İslama daha sıx bağlanmağa sövq etdiyi kimi həm də onlar arasında mənəvi, ruhi, qardaşlıq, dostluq birliyinin formalaşmasında önəmli rol oynayırdı.

Əhməd Yəsəvi həqiqətə çatmaq yolunda nələr etdiyini bir-bir sadalayır. Qeyd edir ki, həqiqətə çatmaq istəyənlər meydanda çoxdur. Həqiqəti axtaran yüz min ariflərin hər biri vəhdət şərabını içmək üçün meydanda gəzir, dolaşırlar. Ancaq Əhməd Yəsəvi özü həqiqətə çatmaq üçün həqiqət dənizinə girdiyini, buradakı bütün varlıqları gördüyünü, incini sədəfə, cəvahiri öz yerində gördüyünü bildirir. Açıq demək istəyir ki, həqiqət olan yerdə hər bir şey öz qaydasında və məkanında olur.

Türkün düşüncəsində böyüyə hörmət, hətta xidmət səadətə yetməyin yollarından biri hesab olunmuşdur. Böyüklərin sözünü böyük tutmaq kiçiyə böyüklük gətirən işlərdən biri sayılmışdır. Türkün düşüncəsində böyüklüyün özünə dualist mövqedən yanaşılmışdır. Böyüyə xidmət göstərmək dedikdə həm vəzifəcə böyük, həm də yaşca böyük nəzərdə tutulmuşdur.

Türkə görə, yol da, ədəb-ərkan da, söz də böyüyün ixtiyarındadır. Böyüyün əlində olan bu yola qoşulan xeyir tapar, onun sözünə qulaq asanlar xoşbəxt olar. Odur ki, türkə görə, kiçik həmişə böyüyün yanında özünü suçlu hesab etməlidir.

Ancaq ulularımızın hər şeyi zamanın üstünə yıxması da türkün bədii düşüncəsinin bir priyomu kimi qəbul olunmalıdır. Görünür ki, türk burada böyük-kiçik münasibətlər sisteminin pozulmasını daha çox zamanın, dövrün, mühitin dəyişməsində axtarmışdır. Bununla belə, onu da yaxşı bilmişdir ki, zamanın da, dövrün də, mühitin də övladı insandır. O insan ki, həmin insan valideynindən daha çox zamanına, dövrünə, mühitinə bənzəyir. Ancaq buna baxmayaraq, türk babalarımız hər bir kəsin – böyüyün də, kiçiyin də boynuna yük qoymuşdur. Hər bir kəsi məsuliyyətini dərk etməyə çağırmışdır və böyüklərə üzünü tutaraq: “Çalış ki, kiçiklər səni saysınlar” – demişdir.

Böyük türkün “Divani-hikmət”ində dinindən, rəngindən, irqindən asılı olmayaraq, bütün insanlara Allah tərəfindən yaradılmışların hamısına bir sevgi və məhəbbət təbliğ edilir. Onun bu fikirləri Yunus İmrənin “Yaradılanı sev, əməllərinlə, yaşadığın həyatınla ona Haqqa gedən yolu göstər”

düşüncəsi ilə vəhdət təşkil edir. Əhməd Yəsəvidəki və Yunus İmrədəki eyni düşüncə tərzinin müxtəlif ifadə formaları özünün təsdiqini tapır. Necə olur ki, hər iki təriqət adamı eyni cür düşünür? Birincisi, hər ikisi eyni yaddaşdan, eyni mənbədən və genetik düşüncə tərzindən qaynaqlanırdı. İkincisi, hər ikisi təriqət əhli olmaqla haqqı, ədaləti, həqiqəti axtarırdı. Üçüncüsü, hər ikisi Allahın qulu olmaqla ona itaət edir, onun əmrlərinə tabe olurdu. Bu cür yaxınlıqlar və digərləri hər ikisində müşahidə olunan ortaq cəhətlərlə diqqəti cəlb edir. Düşüncə tərzində ortaq olan cəhətlər ən bariz şəkildə öz əksini Əhməd Yəsəvinin hikmətlərində tapırdı.

Əhməd Yəsəvinin "Dünya benim diyenler" barəsində söylədiyi hikmətlər Yunus İmrədə ayrı bir formada, üslubda və poetik biçimdə, əslində isə eyni məzmuna, ideyaya xidmət etməklə səslənir.

Söz insan qəlbinə yol tapırsa, onda müqəddəsləşir, hikmət xəzinəsi kimi ürəkləri fəth edir, diri və canlı olur. Hər zamanın, dövrün ən tutarlı silahı rolunu oynayır. Belə hikmət xəzinəsi sırasında türkün yazılı abidələri türkün həyatını, məişətini, dünyagörüşünü, psixologiyasını, düşüncə tərzini yaşatmaqla yanaşı, yarandığı tarixi dövrün özünəməxsusluqlarını da yaşadır. Türkün belə yazılı abidələri sırasında "Oğuznamə"lərin, "Qutadqu biliy"in, "Divani lüğət-it-türk"ün və digərlərinin rolu böyükdür. Bu qəbildən olan kitablarda sözlərin mənaları çox mətləblərdən xəbər verir.

Əhməd Yəsəvi şəriət, təriqət adamı kimi öz hikmətləri vasitəsilə insanlara həqiqəti anlatmağa çalışmışdır. Onun hikmətləri Əhməd Yəsəvi təriqətinin, əqidəsinin, məsləkinin nədən ibarət olduğunu insanlar arasında təbliğ etməyə xidmət etmişdir.

Yəsəvinin hikmətləri hazırda da bir daha onun qüdrətli təriqət adamı olduğunu təsdiqləyir.

***Rəyçi: prof. N.Cəfəov***

## İstifadə edilmiş ədəbiyyat

1. Xəlilov B. Türkün hikmət xəzinəsi: Xoca Əhməd Yəsəvi. Bakı: Elm və təhsil, 2010.
2. Füzuli Bayat. Xoca Əhməd Yəsəvi və xalq sufizminin bəzi problemləri. Bakı, 1997.
3. Ahmed-Yəsəvi. Divan-ı hikmetten seçmeler. Ankara, 2000.
4. Min beş yüz ilin oğuz şeiri. Antologiya, I kitab. Bakı, 1999.
5. Oğuznamə. Bakı, 1987.
6. Qabusnamə. Bakı, 1989.

**Б.Халилов**

**Турецкие начала духовного происхождения**

**Резюме**

В статье говорится о произведении Ахмеда Ясеви ("Диване-хикмет"), о мудрых словах, о воспитательных моралях, получивших место в нем. Педагогико-воспитательные мысли Ахмеда Ясеви открыли дорогу в педагогической анталогии.

**B.Khalilov**

**Turkish sources of moral evolution**

**Summary**

The article is dedicated to the work "Divani- hikmət"by Ahmad Yasavi, his wise phrases and educational ideas. It is noted that Ahmad Yasavi's pedagogical educational thoughts led to pedagogical anthologies.

XX əsrin ədəbi-pedaqoji mühitində mütərəqqi məzmun və mündəricəyə malik tədris vəsaitlərinin yaradılmasında, onların dəyərli əsərlərlə təchiz edilməsində F.Köçərli, həqiqətən, böyük fədakarlıq göstərirdi.

Uşaqlar üçün faydalı materiallarla təchiz edilmiş təlim və tədris kitablarının olmaması böyük pedaqoqu ciddi şəkildə narahat edirdi. O, yaxşı dərk edirdi ki, böyüməkdə olan nəsildən ötrü yaxşı kitabların yaradılması üçün əsərlər gərəkdir. Firidun bəyə görə bu cür kitab və əsərlərin olmaması “milli məktəblərimizin pərişan halı”na və “üsuli-tədrisin biüsul və binizam olması”na  səbəb olmuşdur. 1909-cu ildə “Tərəqqi” qəzetində çıxan “Müəllimlərimiz və onların halı” məqaləsində ana dilində yeni, faydalı dərslik və qiraət kitablarının yaranmasından ruhlanan müəllif daha əvvəlki pedaqoji atmosferi xatırlayıb yazırdı: “Təlim və tədris üçün ana dilimizdə kitablarımız olmadığına görə müəllim əfəndilər fars və ərəbdən hansı kitabı xoşlasa idilər, şagirdlərinə ondan dərs verərdilər”. Köçərli bu halın gənc nəslin milli məhəbbət ruhunda böyüməsinə zərər vurduğunu, onları milli hislərdən uzaqlaşdırdığını söyləyirdi.

Məlum olduğu kimi, haqqında danışılan dövrdə orta əsrlərin uzunömürlü tərbiyə və təhsil sistemi yaşamaqda davam edirdi. Bir sıra məktəblərdə yenə də dərslik və tədris vəsaiti kimi “Tarixi-Nadir”, “İnşai-Mirzə-Mehdixan”, “Təbiri-xab”, “Gülsüm nənə”, “Əlifleyla”, “Camei-Abbas”, “Bustan”, “Gülüstan”, “Leyli və Məcnun” və s. bu tipli əsərlərdən istifadə olunurdu. Açıqfikirli qələm sahibləri və mütərəqqi maarifpərvərlər məktəblərdə bu cür kitabların tədrisinə etiraz edir, onların müasir ruhlu, yararlı əsərlərlə təmin edilmiş dərsliklərlə əvəz olunması tələbini qoyurdular.

F.Köçərli 1909-cu ildə “Tərəqqi” qəzetinə yazdığı bir məqalədə məktəblərdə təlim zamanı oxutmaq üçün bəhrəli əsərlərin azlığından şikayətlənirdi.

Tənqidçi-pedaqoq dərsliklərin necə əsərlərlə təchizi məsələsinə çox həssas və qayğıkeş münasibət bəsləyir və bu sahədə xidmət edənlərə bir örnək kimi nümunələr də göstərirdi. Bu mənada Firidun bəy K.D.Uşinskinin “Rodnoye slovo” (“Ana dili”) kitabına yüksək qiymət verirdi.

Köçərli dərsliklərin uşaq ədəbiyyatı nümunələri ilə təchiz edilməsi ilə əlaqədar əməli işə hələ XIX əsrin 80-ci illərində İrəvan seminariyasında müəllim işləyərkən başlamışdır. F.Ağazadə “F.Köçərlinin bioqrafiyası”nda A.O.Çernyayevskinin Köçərliyə bir məktubundan sitat verərək “Vətən dili” dərsliyini tərtib etməkdə olan müəllifin Firidun bəyin “Bənövşə”, “Çiçək”, “Dilənçi” və s. kimi tərcümələrini öz dərsliyinə daxil etmək niyyətində olduğunu qeyd edir.

F.Köçərli Mahmud Əfəndizadə ilə birlikdə “Tarixi-müqəddəs” adlı bir şəriət dərsliyi də tərtib etmişdi. Həmin kitab Zaqafqaziya darülmüəlliminin müsəlman şöbəsinin müfəttişi F.Smirnov tərəfindən rus dilinə tərcümə edilmiş və kitab 1899-cu ildə iki dildə – Azərbaycan və rus dillərində (hər iki dildə olan mətn bir kitabda) nəşr olunmuşdu.

Köçərlinin dini dərslik tərtib etməsi bir tərəfdən onun şəriət müəllimi kimi çalışması ilə əlaqədar idisə, digər tərəfdən də Firidun bəyin özünün şəxsi dünyagörüşü, dinə rəğbəti ilə bağlı idi. 1903-cü ildə nəşr olunan “Литература азербайджанских татар” kitabının dərsliklərə həsr olunmuş hissəsində də müəllif Zaqafqaziya şeyxülislamı Əbdüssəlam Axundzadənin müsəlman məzhəbi və şəriət tarixi haqqındakı “Risaleyi-ümdətül-ehkam”,“Zibdətül-ehkam” və “Tarixi-müqəddəsi-ənbiya” kimi şəriət dərsliklərini tərifləyir, bu kitabların “indi ən çox yayılmış və ən çox hörmət edilən”  dini dərsliklər olduğunu söyləyirdi.

“Tarixi-müqəddəs”i tərtib edərkən F.Köçərli və M.Əfəndizadə Qori Müəllimlər Seminariyasının Azərbaycan şöbəsində (Zaqafqaziya Darülmüəlliminin Tatar şöbəsində) şəriət müəllimi işləyirdilər. Bu kitabı da tədris etdikləri şəriət fənninin ehtiyaclarını ödəmək və həmin fənnin tədrisi üçün dərs vəsaiti kimi meydana gətirmişdilər.

Qafqaz müftisi və şeyxülislam kimi nüfuzlu din xadimlərinin dərsliyə rəy verməsi təbii idi. Bu seminariyanın tələbələri üçün nəzərdə tutulmuş ciddi tədris kitabı idi. Elə müəlliflər özləri də onu ciddi elmi prinsip əsasında yazmışdılar. Kitabın titul səhifəsində F.Köçərli və M.Əfəndizadə onu “tərtib edənlər” kimi təqdim olunsalar da, əslində müəllif idilər. Çünki mətnlər tərtib prinsipi ilə ərsəyə gətirilməmişdi, yəni başqa mənbələrdən eynilə götürülməmişdi.

F.Köçərli kiçik və yeniyetmə oxuculara təqdim olunacaq əsərlərin istər məzmun, istərsə də dil və üslub etibarilə sadə, anlaşıqlı, səmimi olması barədə nəzəri mülahizələrinə bu dərs vəsaitində bütünlüklə əməl etmişdi. Belə ki, XIX əsrin II yarısı və XX əsrin əvvəllərində məktəb və mədrəsələrdə təhsil alanlardan ötrü bir sıra şəriət kitabları yazılmışdı. Onların əksəriyyətinin dili qəliz, ərəb-fars söz və ifadələri ilə “yüklənmiş” şəkildədir. F.Köçərli və həmkarının dərsliyinin dili isə sadə, aydın, səmimi, anlaşıqlı, uşaqların və gənc oxucuların səviyyəsinə bütünlüklə uyğundur.

Köçərli dərsliklərdə milli ədəbiyyat nümunələrinə daha geniş yer verilməsinin tərəfdarı idi. Bəzi dərslik müəlliflərinin tərtibat zamanı milli mənbələrdən uzaqlaşması, azərbaycanlı şair və yazıçıların əsərlərinə az yer ayırması qeyrətkeş alimi narazı salırdı. A.Şaiqə 10 fevral 1913-cü il tarixli məktubunda F.Ağazadənin “Ədəbiyyat məcmuəsi” ilə bağlı tutduğu irad bunu bariz şəkildə sübut edir. Məktub müəllifi “Ədəbiyyat məcmuəsi”ndə həm dilin ağırlığına və qəlizliyinə, həm də milli ədəbiyyat nümunələrinə az yer verilməsinə etiraz edirdi.

“Ədəbiyyat məcmuəsi” təkcə Köçərli deyil, ümumiyyətlə, dövrün ədəbi-pedaqoji ictimaiyyəti tərəfindən narazılıqla qarşılanmışdı. Demokratik fikirli ziyalılar F.Ağazadəyə dərsliyin tərtibi zamanı milli mənbələrdən uzaqlaşdığına görə ciddi irad tutmuşdular.

Firidun bəy dərsliklərə və buradakı əsərlərə ciddi diqqət və tələbkarlıqla yanaşırdı. Biz onun müxtəlif dərsliklərdə millət balalarının təlim, təhsil və tərbiyəsi üçün təklif olunan əsərlərə münasibətinin şahidi oluruq.

“Təlim kitabı qayırmağ”ın “çox mühüm və çətin əmr” olduğunu, “onu yazmaqda artıq ehtiyat və diqqət lazım” gəldiyini nəzərə çatdıran tənqidçi “Gülzar”ın (A.Şaiq) dil qüsuruna kəskin irad tutsa da, kitabdakı materialları bəyənirdi. Onun “rəy və təsəvvüratı”na görə dərsliyə daxil edilmiş əsərlər məzmunlu, dolğun və təqdirəlayiqdir. Elə buna görə də Köçərli bu dərsliyi “ali sinifdə oxuyan şagirdlərə ən yarar və münasib qiraət kitabı” hesab edirdi.

A.Şaiqin istər mövzu, məzmun və ideya, istərsə də sənətkarlıq xüsusiyyətlərinə görə kamil və dəyərli bir uşaq əsəri olan və “Gülzar” dərsliyinə daxil edilən “Bəxtiyarlığım” (“Köç”) hekayəsini də tənqidçi “məalı”na və “ədibanə yazılma”sına görə tərifləyirdi. Gələcəkdə “gözəl nümunələrlə ”Gülzar”ı müzəyyən qılmağ”ı məsləhət görən ədəbiyyatşünas alim A.Şaiqin dərslikdəki Molla Ruhulla və Sabirə həsr olunmuş sadə, anlaşıqlı və məzmunlu şeirlərinin də kiçik oxucular üçün maraqlı və bəhrəli olduğunu qeyd edirdi.

Köçərli A.Şaiqə məktubunda “Üçüncü” və “Dördüncü il”in tərtibinə “şüru edil”məsini böyük sevinc hissi ilə qarşılayırdı. Ədəbi-pedaqoji həyatın ehtiyaclarını yaxşı duyan müəllim kimi bu cür “kitabla-

rın yoxluğunun" "təlim işlərimizi geriyə saldığı"nı aydın dərk edirdi.

Doğrudan da, M.Mahmudbəyov və A.Səhhətin tərtib etdikləri "Yeni məktəb" ("Üçüncü il", 1909) dərsliyi məzmunlu və çox əhəmiyyətli olub dövrün ziyalıları tərəfindən fərəhlə qarşılanmışdı. "Tərəqqi" qəzetindəki bir məqalədə deyilirdi: "Məktəblərimizdə oxumaq üçün birinci və ikinci ilin ana dili kitabları hikmətli müəllimlərin çalışmaları sayəsində hazır edilib. Üçüncü il üçün kitab lazım idi ki, o da haman yolda işləyən Mahmud bəy Mahmudbəyov və şair A.Səhhət Mehdizadə cənabları tərəfindən tərtib edilib, öz vaxtında mövqeyi-intişara qoyulubdur". F.Köçərli "Tərəqqi" qəzetində nəşr olunan resenziyasında "Yeni məktəb"in yaxşı bir dərslik kimi müxtəlif cəhətlərindən danışmaqla buradakı əsərləri də sadə məzmununa, anlaşıqlı dilinə, yararlı keyfiyyətlərinə görə alqışlayırdı.

Hər şeydən əvvəl, qeyd edək ki, bu dərsliyin pedaqoji fikir tariximizdə misilsiz rolu vardır. Akademik M.Mehdizadənin dediyi kimi: "Yalnız bu dərsliyin təzahüründən sonra məktəblərdə Azərbaycan dilinin tədrisi müəyyən düzgün pedaqoji və metodiki istiqamət kəsb etmişdir".

"Vətən dili"nin əhəmiyyəti təkcə onun pedaqoji irs kimi dəyərində, yeni tipli məktəbə uyğun ilk yeni dərslik olmasında deyildi. Bu dərslik Azərbaycan uşaq ədəbiyyatının inkişafında da, həqiqətən, kifayət qədər səmərəli rol oynamışdır.

"Vətən dili"nin müəllifi A.O.Çernyayevski Köçərlinin sevdiyi və böyük hörmət bəslədiyi müəllimlərdən idi. Firidun bəy öz müəlliminin ölümündən sonra onun haqqında iki məqalə yazmış və onu dərin ehtiramla yad etmişdir.

Çernyayevskinin ölümündən xeyli sonra Köçərli "Vətən dili" üzərində yenidən işləmiş, onu müasir tələbə uyğunlaşdırmış və iki dəfə (1908, VI çap; 1910, VII çap) nəşr etdirmişdir. Firidun bəy dərslik üzərində işləyərkən onda əhəmiyyətli dəyişikliklər aparmış, bir sıra şeir və hekayələri çıxararaq onları yeni, daha faydalı hesab etdiyi əsərlərlə əvəz etmişdi. Ümumiyyətlə, kitabda uşaq anlayışına uyğun olan kiçik məqalələr, təmsillər, orijinal və tərcümə edilmiş şeirlər öz əksini tapmışdır.

"Vətən dili"nin VII nəşri çapdan çıxdıqdan sonra müəllim Şirvanski "Zaqafqazye" qəzetinə məqalə yazıb kitaba bir sıra yersiz iradlar tutmuş, Köçərlini dərsliyin tərtibi zamanı "milli və orijinal" mənbələrdən uzaqlaşmaqda günahlandırmışdı. "Zaqafqazye" qəzetinin 1910-cu il tarixli 74-cü nömrəsində çıxmış "Vətən dili" dərsliyi haqqında cənab Şirvanskinin rəyi münasibətilə" cavab məqaləsində Köçərli ona əsaslı cavab vermiş, Şirvanskinin dərsliyə və buradakı əsərlərə verdiyi qiymətin "bir o qədər də ədalətli olmadığını" tutarlı və məntiqli şəkildə sübut etmişdi.

"Vətən dili" dərsliyi üzərində yenidən işləyərkən Firidun bəy Çernyayevskinin yararlı materiallar seçmək və bu materialı canlı uşaq dilində düzəldib təqdim etmək kimi nəcib bir işini ləyaqətlə davam etdirmişdi. Səriştəli pedaqoq dərsliklərdəki bədii əsərlərə həssas və ciddi münasibət bəsləmiş, tərtibat zamanı bir sıra şeir və hekayələri yeniləri ilə əvəz etməyi lazım bilmişdi.

Firidun bəy dərsliyə "Dostluq təsiri", "Çoban və kuzə", "Bahar", "Layla", "Uşaqlar və quş", "Novruz", "İlan və zəli" və s. kimi məzmunca dolğun, ideyaca əhəmiyyətli, dil və üslubi keyfiyyətlərinə görə səviyyəli, kiçik oxucular üçün təsirli və anlaşıqlı şeirlər əlavə etmişdi. "Vətən dili" üzərində yenidən işləyərkən Köçərli dərsliyə "Küpə və qazan", "Kar, kor və çolaq", "At və xış", "Mehriban qardaş", "Hər işdə nizam lazımdır", "İki dost", "Baba və nəvəsi", "Əkinçi və oğlu", "Maral və üzüm tənəyi", "Quşlara rəhm eləyin" və s. kimi mənsur nümunələr də daxil etmişdi. Köçərlinin

dərsliyə daxil etdiyi hekayələrin dili son dərəcə sadə və anlaşıqlıdır.

Klassik Azərbaycan ədəbiyyatının təbliğində, çoxlu sayda milli bədii örnəklərimizin oxucu auditoriyasına çıxarılmasında Firidun bəyin müstəsna xidmət göstərdiyi məlum həqiqətdir. O zamankı məktəb dərsliklərinin tərtibi zamanı müəlliflər tədqiqatçının klassiklərimizlə bağlı tədqiqatlarından səmərəli şəkildə faydalanırdılar. Göründüyü kimi, Köçərli öz dövrünün məktəb dərslikləri ilə bağlı məhsuldar və səmərəli fəaliyyət göstərmiş, istər dərsliklərin tərtibi, istərsə də onların yararlı əsərlərlə təchiz edilməsi sahəsində diqqətəlayiq və nəcib işlər görmüşdür.

***Rəyçi: dos. Ə.İmanov***

## İstifadə edilmiş ədəbiyyat


1. Azərbaycan pedaqoji antalogiyası. Bakı, 2008.
2. Ağayev Ə. XX əsrin əvvəllərində Azərbaycanda məktəb və pedaqoji fikrin inkişafı istiqamətləri. Seçilmiş əsərlər. I cild. Bakı, 2011.
3. Проблемы школьного учебника. Москва, 1976.
4. Köçərli F. Seçilmiş əsərləri. Bakı: Azərb. SSR EA Nəşriyyatı, 1963.
5. Ağazadə F. (Şərqli). F.Köçərlinin bioqrafiyası. AMEA RƏİ, Arx.24, Q-7 (176).
6. Əfəndizadə M. Köçərli F. Tarixi-müqəddəs (müsəlmanlardan ötrü türk dilində rus tərcüməsi ilə). Tiflis, 1899.
7. Köçərli F. “Yeni məktəb”. “Tərəqqi” qəzeti, 1909, 1 sentyabr.
8. Азимова С. Педагогическая деятельность и педагогические взгляды Фиридун бека Кочарлинского. Дисс… канд. пед. наук. Баку, 1977.
9. Кочарлинский Ф. Памяти А.О.Черняевского. Газ. «Новое обозрение», Тифлис, 1895, 14 декабря.


**Ш.Магеррамова**

**Выдающийся педагог Ф.Кочарли и школьные учебники**

**Резюме**

Начиная с 70-х годов XIX века открывались школы на родном языке, которые создавали особое оживление в художественно-педагогической жизни, активизация деятельности школ и просветительских учреждений побудило к претворению в жизнь новых мероприятий в этой области.

В конце XIX начале XX веков Ф.Кочарли выполнил достойные внимания работы для создания школьных учебников, насыщения их значимыми и содержательными произведениями. В этот период Кочарли выступал строгим и активным сторонником ознакомления подрастающего поколения с цельными современными произведениями посредством современных учебников.

**Sh.Maharramova**

**Outstanding educator F.Kocharly and his school textbooks**

**Summary**

Native language schools establishing since 70th years of XIX century, created special renaissance in a literary – pedagogical life, enlargement of schools and educational life made necessary accomplishment of measures with reference to this field.

F.Kocharli performed noteworthy works with respect to the origination of textbooks in the end of XIX century and in the XX century, provision of these textbooks with important and useful works. Kocharli is a severe and active supporter of presenting modern works through these textbooks to the children at this time.



# DƏYƏRLİ PEDAQOQ, USTAD BƏSTƏKAR

**Ağahüseyn Anatolluoğlu,**
***Azərbaycan Milli Konservatoriyasının baş elmi işçisi, sənətşünaslıq üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *pedaqoji fəaliyyət, repertuar, tar, not, mahnı-romans, orkestr, ifaçılıq sənəti.*

***Ключевые слова:*** *образовательная деятельность, репертуар, тар, ноты, песни-романсы, оркестр, исполнительское искусство.*

***Key words:*** *educational activities, repertoire, tar, notes, song-romances, orchestra, performing arts.*

Zəngin yaradıcılığı ilə milli musiqi sənəti salnaməmizə yeni səhifələr yazmış istedadlı bəstəkar, Azərbaycanın əməkdar incəsənət xadimi, görkəmli pedaqoq Qəmbər Hüseynlinin anadan olmasının 100 illiyi tamam olur. O, Azərbaycan bəstəkarlıq məktəbinin tanınmış nümayəndəsi, zəngin yaradıcılığı ilə milli musiqi sənəti salnaməsinə yeni səhifələr yazmış, Azərbaycan musiqi tarixində əbədi olaraq qalma haqqı qazanmışdır. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamı ilə milli mədəniyyətimizin zənginləşdirilməsi və tanıdılması işinə sanballı töhfələr vermiş bəstəkarın 100 illik yubileyi təntənəli şəkildə qeyd olunur.

Böyük bəstəkarımız Qəmbər Hüseynlinin taleyi əsasən milli alətimiz olan tarla bağlıdır. Digər musiqi alətində tədris almasına baxmayaraq o, bütün ömrü boyu tar alətinə və tar sənətinə ürəkdən bağlı olmuş, ondan bir an belə ayrılmamışdır. O illərin xatirələrini qələmə alan Ruqiyyə Rzayeva-Bağırovanın yazılarından oxuyuruq: "–1934-cü ilin avqust ayında mən və bacım Ağabacı dahi bəstəkar Üzeyir bəyin təkidi ilə konservatoriyanın hazırlıq şöbəsinə daxil olduq. Ağabacı tar, mən kamançada ifa edirdik. Qəmbər Hüseynli violonçel sinfində oxumasına baxmayaraq biz onu tar ifaçısı kimi tanıyır və hamımız Üzeyir bəyin radio komitəsində təşkil etdiyi notlu xalq çalğı alətləri orkestrində çalırdıq".

Burada bir faktı da qeyd etmək yerinə düşərdi. Azərbaycan musiqi mədəniyyətinin bir çox tanınmış simaları Qəmbər Hüseynli kimi musiqi təhsillərini məhz tar aləti ilə başlamış, bu alətin sirlərinə, onda ifa edilən muğamları, xalq mahnıları, rəng və təsnifləri, rəqs və diringiləri öyrənə-öyrənə biliklərini mükəmməlləşdirmiş, sonradan musiqi ictimaiyyətimizin əvəzolunmaz simaları səviyyəsinə yüksəlmişlər. Belə sənətkarlardan S.Rüstəmovu, F.Əmirovu, H.Xanməmmədovu, A.Məlikovu, A.Rzayevanı, S.Ələsgərovu, Ə.Cavanşirovu və başqalarını göstərə bilərik. Onlar gələcəkdə yaradacaqları ölməz sənət incilərinin ladməqam, intonasiya xammalını məhz tar alətini ifa edə-edə əxz etmiş, həmçinin həyat və fəaliyyətləri ilə tar ifaçılığı sənətinin inkişafında böyük xidmətlər göstərmişlər. Belə sənətkarlarımızdan biri olan Əməkdar incəsənət xadimi, dünyaşöhrətli sevimli bəstəkarmız Q.Hüseynli 1916-cı il aprelin

16-da Azərbaycanın qədim mədəniyyət mərkəzlərindən olan, Azərbaycan elminə, incəsənətinə və musiqi mədəniyyətinə böyük simalar bəxş etmiş Gəncədə dünyaya göz açmış və ilk musiqi təhsilini burada almışdır. Ailədə onun incəsənətə olan böyük marağını və istedadını nəzərə alaraq onun Gəncə musiqi məktəbinin tar sinfinə getməsini məsləhət bilirlər. O, burada musiqi təhsilini gələcəyin böyük bəstəkarı F.Əmirov və istedadlı tarzəni Zərif Qayıbovla birlikdə alır. Elə ilk günlərdən tar ifaçılığının sirlərinə, xalq musiqisi və klassik muğamların incəliklərinə dərin yiyələnmək marağı qısa bir zamanda onun bu sahədə uğurlarına, daxili imkanlarının çiçəklənməsinə səbəb olur. Q.Hüseynli tarda not və muğam ifaçılığına mükəmməl yiyələnməklə yanaşı məhz bu dövrdə milli folklora əsaslanan ilk mahnı və tar aləti üçün kiçik pyeslərini bəstələməyə başlayır. Çox keçmir ki, kiçik Qəmbər öz sevimli tarı ilə şəhərin mədəni həyatında yaxından iştirak edir, dram dərnəyinin tamaşalarında aktyorların monoloqlarını müşayiət edirdi.

Göründüyü kimi, Q.Hüseynlinin tar ifaçılığı sənətindəki rolunu ilk öncə iki istiqamətdə müəyyənləşdirə bilərik: bir tərəfdən tarzən kimi şifahi ənənəli milli musiqinin və bəstəkar əsərlərinin mahir ifaçısı; digər tərəfdən isə tar alətinin ifaçılıq repertuarını öz əsərləri ilə zənginləşdirən bir bəstəkar kimi. Onun fəaliyyətini təhlil edərkən görürük ki, yaradıcılığının bütün mərhələlərində bu iki sahəni inkişaf etdirməyə çalışmış, ansambl və orkestrlərdə tarzən və solist kimi çıxış etmiş, digər tərəfdən istedadlı bəstəkar kimi bir-birindən gözəl əsərlər yaratmışdır.

Q.Hüseynli 1934-cü ildə təhsilini davam etdirməkdən ötrü Bakıya gəlir və Azərbaycan Dövlət Musiqi Texnikumuna daxil olur. Əvvəldə qeyd etdiyimiz kimi, ona violonçel sinfində təhsil almaq təklif olunur. Lakin ondakı bəstəkarlığa olan maraq və bacarığı görən rəhbərlik onu bəstəkarlıq şöbəsinə Q.Z.Burşteynin sinfinə keçirir. Bu zaman o, böyük ədib C.Cabbarlının sözlərinə "Tellər oynadı" (1939) mahnı-romansını bəstələyərək öz üslubu olan istedadlı bir bəstəkar kimi özünü təsdiqləyir. Q.Hüseynlinin sonrakı yaradıcılığı, əsasən, bəstəkarlıq fəaliyyəti ilə bağlı olsa da, o, ölkənin mədəni həyatında var qüvvəsi ilə çalışmış, işlədiyi bütün sahələrdə böyük inkişafa nail olmuşdur.

Onun tar ifaçılığı sənətindəki digər bir xidməti istedadlı gənclərin üzə çıxarılması və onlara tar ifaçılığı sənətinin öyrədilməsi ilə bağlıdır. O, hələ ilk tələbəlik illərindən başlayaraq müxtəlif mədəni-maarif və musiqi müəssisələrində, ayrı-ayrı ümumtəhsil məktəblərində, fabriklərdə bir sıra musiqi kollektivlərinə və özünün yaratdığı özfəaliyyət dərnəklərinə, xor kollektivləri və instrumental ansambllara rəhbərlik edərək bu sahədəki böyük bacarıq və istedadını təsdiqləyir.

Onun tar ifaçılığı sənətinin inkişafındakı rolundan söz açarkən mütləq Şuşa Musiqi Texnikumuna rəhbərlik etdiyi dövrü qeyd etməliyik. O, burada cəmi bir il müddətində (1939-1940) çalışmasına baxmayaraq, tədris proqramlarının təkmilləşdirilməsi, təcrübəli musiqiçilərlə yanaşı gənc istedadlı mütəxəssislərin texnikumda pedaqoji fəaliyyətə cəlb olunması kimi mühüm tədbirləri həyata keçirir.

1940-cı ildə Bakıya dəvət alan Q.Hüseynli filarmoniyanın tərkibində fəaliyyət göstərən xalq çalğı alətləri orkestrində dirijor köməkçisi işləməklə

yanaşı Ü.Hacıbəylinin təşəbbüsü ilə sazçı qızlar ansamblını yaradır (1945-1947) və ona rəhbərlik edir. 1951-ci ilə qədər Bakı və Gəncə filarmoniyalarında və Gəncə Dövlət dram teatrında bir sıra məsul vəzifələri icra edərək bu kollektivlərdə əsaslı inkişafa nail olur. Belə ki, bəstəkarın təşəbbüsü ilə Gəncədə aşıqlardan ibarət xor kollektivi yaranır, filarmoniyada fəaliyyət göstərən bütün musiqi kollektivlərinin repertuarı zənginləşir, peşəkar səviyyəsi yüksəlir, teatr tamaşalarında musiqidən məqsədyönlü şəkildə geniş istifadə olunur. O, işlədiyi müxtəlif ümumtəhsil, texniki peşə və musiqi məktəblərində xalq çalğı alətləri ansamblının tərkibinə xüsusi əməli köməklik göstərmiş, əhali arasında milli-mənəvi dəyərlərin yayılması üçün var qüvvəsi ilə çalışmışdır. Digər milli alətlərimizlə yanaşı tarın orkestrdə daha parlaq tembr boyaları ilə səslənməsi üçün ansamblların repertuarına müvafiq musiqi nümunələri daxil edir, bu imkanları üzə çıxaran bir sıra instrumental əsərlər bəstələyir.

Gəncədə işlədiyi dövr Q.Hüseynlinin yaradıcılığında öz məhsuldarlığı ilə seçilir. O, bir-birinin ardınca “Ey gözüm, de görmədinmi” (söz.: N.Gəncəvi), “Dağlar”, “Gülə-gülə” (söz.: S.Vurğun), “Ceyran”, “Nədən oldu” (söz.: Aşıq Ələsgər), “Söz olur” (Söz.: O.Sarıvəlli) vokal əsərlərini, C.Cabbarlının “Almaz”, Ə.Haqverdiyevin “Dağılan tifaq”, Ə.Abbasovun “Bahar nəğməsi” tamaşalarına musiqi bəstələməklə milli musiqi xəzinəmizi daha da zənginləşdirmişdir.

Öz təhsilinə və yaradıcılığına xüsusi tələbkarlıqla yanaşan Q.Hüseynli təhsilini artırmaq üçün 1951-ci ildə yenidən Asəf Zeynallı adına Bakı Musiqi Texnikumunun bəstəkarlıq şöbəsinə daxil olaraq professor B.İ.Zeydmanın sinfində təhsilini davam etdirir. Bu illər ərzində onun bəstəkarlıq fəaliyyəti daha geniş vüsət alır.

Q.Hüseynli özünün bəstəkarlıq fəaliyyəti ilə də bilavasitə tar ifaçılığı sənətində, o cümlədən gənc tarzənlərin ifaçılıq keyfiyyətlərinin, musiqi-estetik zövqlərinin formalaşmasında müstəsna rol oynamışdır. Belə ki, bütün alətlərdə olduğu kimi tar ifaçılığı sənətinin inkişaf etdirilməsini şərtləndirən əsas cəhətlərdən biri də bu alətdə ifa edən bütün yaş qruplarına aid ifaçılar üçün zəngin tədris-pedaqoji, konsert-ifaçılıq repertuarının olması, bu repertuarın daim yenilənməsidir. Bu baxımdan sevimli bəstəkarımızın yaradıcılığı tar ifaçılığı sahəsində çalışan bütün müəllim və tələbələr, ifaçılar üçün həmişə repertuar bazası rolunu oynamış və əminik ki, tar ifaçılığı sənəti yaşadıqca bu xəzinəyə müraciətlər davam edəcəkdir.

Q.Hüseynlinin bəstəkarlıq fəaliyyəti təkcə mahnı-romanslar və dram əsərlərinə yazmış olduğu musiqilərlə bitmir, milli genofondumuz olan uşaqlara qayğı onun yaradıcılığında hər an üstünlük təşkil etmiş, o, bu səpkidə çoxlu əsərlər bəstələmişdir. Onlardan bir çoxu hal-hazırda tar ifaçılığı proqramlarında möhkəm yer tutur. Bir faktı qeyd etmək yerinə düşərdi ki, Q.Hüseynlinin 1947-ci ildə şair T.Mütəllibovun sözlərinə bəstələmiş olduğu “Cücələrim” uşaq mahnısı tez bir zamanda nəinki o vaxtkı Sovetlər İttifaqında, hətta bir çox dünya ölkələrində məktəblilərin ən sevimli mahnısına çevrilmiş, müəllifinə dünya şöhrəti qazandırmışdır.

Bu sahədəki araşdırmalar göstərir ki, Q.Hüseynli yaradıcılığına bir çox pedaqoq-tarzənlər və tarzən-ifaçılar tərəfindən zaman-zaman müraciətlər edilmiş və hal-

hazırda da bu proses davam edir.

Q.Hüseynli öz çoxşaxəli yaradıcı fəaliyyəti ilə bir an belə boş oturmamış, qısa, lakin mənalı ömrünü təkcə tar və digər musiqi alətlərimiz deyil, bütövlükdə Azərbaycan musiqi mədəniyyətini zənginləşdirməyə həsr etmişdir. Bu baxımdan onun həyat və yaradıcılığının bütün sahələri tədqiqata cəlb olunaraq öyrənilməli və tədris proqramlarına daxil edilərək tələbələr, həm də bütün musiqisevərlərə təqdim olunmalıdır.

Qəmbər Hüseynli Azərbaycan bəstəkarlıq məktəbinin olduqca istedadlı, dəyərli bir sənətkarıdır. Onun yaratdığı hər bir mahnı, əsər qiymətlidir və tez-tez səslənir. Ancaq Qəmbər Hüseynli çoxlarımıza, eləcə də dünya musiqisevərlərinə dünya şöhrətli “Cücələrim” mahnısının bəstəkarı kimi tanışdır. Azərbaycanda elə bir təhsil ocağı tanımazsan ki, orada “Cücələrim” zümzümə edilməsin, bəstəkarın ölməz “Ay işığında” mahnısı da mahnı janrının ölməz nümunələrindən biridir.

Q.Hüseynli irsinə Azərbaycan dövləti hər zaman böyük qayğı və diqqətlə yanaşıb. Azərbaycan Respublikasının xalq artisti, görkəmli bəstəkarımız Fikrət Əmirov Q.Hüseynli sənətinə, musiqisinə yüksək qiymət verərək yazırdı: “Əgər Q.Hüseynli ömrü ərzində tək bircə “Cücələrim”i yazsaydı, yenə kifayət edərdi ki, onu musiqi sənətinin korifeyi kimi tanısınlar və sevsinlər”. Böyük bəstəkarımız haqlıdır. Çünki onun şöhrətini bütün dünyaya “Cücələrim” yaymışdır. “Bir əsərlə dünyada məşhurlaşmaq hər sənətkara nəsib olmur. Qəmbər Hüseynli “Cücələrim” mahnısı ilə sağlığında özünə abidə ucaltdı” (T.Mütəllibov).

Qədirbilən xalqımız belə hesab edir ki, ölkə başçımızın sərəncamı ilə 100 illik yubileyin keçirilməsi Qəmbər Hüseynli yaradıcılığına, onun ölməz sənətinə verilən dəyərdir.

***Rəyçi: prof. Nazim Kazımov***

## İstifadə edilmiş ədəbiyyat


1. Hacıbəyov Ü. Azərbaycan xalq musiqisinin əsasları. Bakı, 1985.
2. Qurbanəliyeva S., Rəfibəyli L., Seyfullayeva N. Qəmbər Hüseynli yaradıcılığı milli ənənələr kontekstində. Bakı, 2005.
3. Kazımov N. Asəf Zeynallı. Bakı, 2009.
4. Kazımov N. Musiqi kolleci – 110. Bakı, 2008.
5. Гусейнова Т. Азербайджанская камерно-вокальная музыка. Баку, 2005.


**А.Анатоллуоглы**

**Бесценный педагог, великий композитор**

**Резюме**

В статье рассматривается в более широкой форме развитие исполнительский вид искусства - заслуженного деятеля искусств, всемирно прославленного композитора Г.Гусейнли.

**A.Anatolluoglu**

**Dear pedagogue, master composer**

**Summary**

The article deals with a broader form of performing art - of the honored worker of arts, world renowned composer G. Huseynli.



# İQTİSADİ BİLİKLƏRİN TƏDRİSİNƏ DAİR

**Lalə Qurbanova,**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin Şəki filialının baş müəllimi***

Məqalədə ibtidai və yuxarı siniflərdə iqtisadi biliklərin aşılanmasından bəhs edilir. Müəllif bu sahədə görülən işlərə, o cümlədən yeni proqramların hazırlanmasına da toxunur.

***Açar sözlər:*** *iqtisadi biliklər, peşəkar fəaliyyət, metodoloji yanaşmalar.*
***Ключевые слова:*** *экономические знания, профессиональная деятельность, методологические подходы.*
***Key words:*** *economic knowledge, professional activities, methodological approaches.*

Ötən əsrin 90-cı illərindən etibarən Azərbaycanda tədris müəssisələri və cəmiyyət üçün tez-tez dəyişən reallıqlar dövrü başlandı. Bu müddətdə aydın oldu ki, öyrənilən ənənəvi elmlərdən əlavə məktəbdə uşaqlara dərketmə, özünütəkmilləşdirmə üzrə bacarıq, vərdişlər və ölkəmizin bazar iqtisadiyyatına keçməsi ilə əlaqədar uşaqlara yeni həyat şərtlərini adekvat qavrama vərdişləri aşılanmalıdır. Buna görə də məktəbdə həyat bilgisinin, daha sonra iqtisadiyyatın əsaslarının (X-XI siniflər) tədrisi, bu fənnin inkişaf perspektivlərinin müəyyənləşdirilməsi, iqtisadi tərbiyə və mədəniyyətin formalaşdırılması kimi problemlər yarandı.

Lakin bu günə qədər iqtisadiyyatın əsaslarının məktəblərdə tədrisinə baxmayaraq, hələ də eksperiment xarakteri daşıyır. Bu fənni nə üçün öyrətmək, uşağı real iqtisadi münasibətlərə necə qatmaq məsələləri hələ də müzakirə obyekti kimi qalır.

Güman etmək olar ki, şagirdləri öz maraqlarına, gələcəkdə hansı sosial rola sahib olacaqlarını müəyyən etmələrinə istiqamətləndirmək daha məqsədəuyğundur. Təbiidir ki, ibtidai sinif şagirdləri bu suallara cavab verməyə çətinlik çəkər. Lakin yuxarı sinifdə oxuyanlar gələcək təhsilini artıq müəyyənləşdirmiş olurlar. Şübhəsiz, burada təhsil müəssisəsinin istiqaməti də böyük rol oynayır. Bütün ümumtəhsil məktəblərində, universitetlərdə, müxtəlif təmayüllü məktəblərdə təlimi eyni proqramla tədris etmək düzgün sayıla bilməz. Buna görə də hər bir müəssisə üçün proqramın işlənilməsi və təlim materialının verilməsi üsullarının müəyyənləşdirilməsi zəruridir. Ümumtəhsil məktəblərində iqtisadiyyatın əsaslarının tədrisinin məqsədi ondan ibarətdir ki, ümumi inkişaf çərçivəsində şagirdlər insan həyatının iqtisadi və ictimai əsaslarını dərk etsinlər.

Müasir dövrdə fizika, biologiya, tarix elmi ilə də məşğul olanlar bilir ki, hər bir insan iqtisadi biliklərə malik olmalıdır. İqtisadi biliklərə yiyələnmək vacibdir, bu biliklərin hərtərəfli və hər hansı bir sahədə tətbiq olunması məqsədəmüvafiqdir. Çünki hər bir insan öz həyatında həm istehsalçı, istehlakçı və həm də vətəndaşdır. Məlumdur ki, işgüzar və rollu oyunların keçirilməsi

prosesində iqtisadi bilik və bacarıqlar, biznes planlarının yaradılması gələcəkdə müxtəlif sahədə işləyəcək insanlar üçün çox dəyərli təcrübədir.

Hazırda pedaqoji təmayüllü ali məktəblərin müəllimləri, təhsil sistemi işçiləri, metodistlər, ümumtəhsil məktəblərinin və əlavə təhsil müəssisələrinin iqtisadiyyat üzrə təlim keçən müəllimləri üçün yeni proqram layihəsinin hazırlanması da nəzərdə tutulur.

Proqramın məqsədi iqtisadiyyatdan dərs deyən müəllimlərin peşəkar fəaliyyətinin yerinə yetirilməsi üçün kompetensiyaların təkmilləşdirilməsi və yeniləşdirilməsidir.

Proqramda aşağıdakı tələblər qoyulmuşdur:

- İqtisadiyyatın əsaslarının tədrisi metodikasının mərhələlərini müəyyənləşdirmək, təlim prosesində metodik konsepsiyaların və yanaşmaların xüsusiyyətlərini aşkar etmək;
- iqtisadiyyatın əsaslarının tədrisinə konseptual-metodik yanaşmalar haqqında təsəvvür yaratmaq;
- təcrübədə metod, forma və vasitələrdən düzgün istifadəni təmin edən iqtisadiyyatın əsaslarının tədrisi metodikasının nəzəri və metodik əsaslarını işləmək;
- şagirdləri iqtisadiyyatın əsaslarının tədrisi metodikasının yeni nailiyyətləri, müasir təhsil, informasiya texnologiyaları və iqtisadi təhsilin inkişafının tendensiyaları ilə tanış etmək;
- şagirdlərə iqtisadiyyat sahəsində bilikləri ifadə etmək və anlayışları mənimsəmək üçün müasir üsulları, texnologiyaları öyrətmək, təlimin müasir texniki vasitələrindən istifadə etmək bacarığı aşılamaq.

Hazırda iqtisadi biliklərin verilməsi üzrə təcrübə öyrənilir, ümumiləşdirilir və müvafiq tövsiyələr hazırlanır.

Burada da aşağıdakı məqsədlər güdülmüşdür:

- təlim prosesinin elmi-metodik təminatının təkmilləşdirilməsinə yönəlmiş elmi fəaliyyətin inkişafı;
- innovativ fəaliyyətin inkişaf etdirilməsi, elmi və məsləhət xidmətinin göstərilməsi;
- normativ-metodik, informativ-analitik elmi tədqiqatların və metodik işləmələrin hazırlanması;
- məktəblilərdə iqtisadi biliklərin formalaşdırılması və inkişafı üçün şəraitin yaradılması;
- elmi və innovativ fəaliyyətin təlim prosesi ilə sıx əlaqəsinin təmin olunması;
- elmi və innovativ fəaliyyətlə məşğul olan müəssisə əməkdaşlarının nüfuzunun və motivasiyasının yüksəldilməsi.

Proqram və tövsiyələrin əhəmiyyəti:

1. Təlim prosesinin layihələndirilməsi, idarə edilməsi və diaqnostikası ilə əlaqədar dinləyicilərə müasir konseptual - metodoloji yanaşmalar, informasiya təhsili modeli və təlim texnologiyaları haqqında bilik verilir.
2. Müxtəlif sahələrdə kompetensiyaların formalaşdırılması:

- ümumtəhsil məktəblərində iqtisadiyyatın nəzəri və metodoloji əsaslarının tədrisi;
- müasir tələblərin reallaşdırılması ilə əlaqədar təlim prosesinin məzmun və strukturunun müəyyən edilməsi;
- iqtisadiyyat dərslərində iqtisadi mədəniyyətin və vətəndaşlıq mövqeyinin tərbiyə edilməsi öyrədilir.

Bu gün məktəbdə iqtisadi təhsil müxtəlif formada həyata keçirilir. İlkin iqtisadi təhsil ibtidai siniflərdə “Həyat bilgisi” dərslərində, müxtəlif fənlərin tərkibində və ya fakültativ formada keçirilir. Bu, ibtidai siniflərdə tanışlıq xarakteri daşıyır. Bu işin daha səmərəli nəticə verməsi üçün mərhələlər aşağıdakı kimi müəyyənləşdirilir:

1. İbtidai sinif şagirdlərinə elementar iqtisadiyyat haqqında anlayışların verilməsi, izahı obrazlı, emosional, cəlbedici və oyun formasında keçirilməsi.

2. Ümumi iqtisadi təhsil bütün məktəbin tədris planına daxil edilir. 5 – 8-ci siniflərdə iqtisadi elm haqqında ümumi elmi təsəvvür formalaşır. X –XI siniflərdə iqtisadiyyatyönümlü hazırlıq keçirilir, şagirdlər iqtisadiyyatın əsas konsepsiyaları ilə tanış olurlar və peşə seçimi üzrə ixtisaslaşmaya diqqət yetirilir.

3. Növbəti mərhələdə fakültativ məşğələlər keçirilir. Bu, peşəni seçən şagirdlər üçün yuxarı siniflərdə tətbiq oluna bilər.

Məktəbdə iqtisadiyyatın təlimi ilə əlaqədar bütün problemləri dörd qrupa bölmək olar:

1. Məktəbdə tətbiq olunan proqramların problemləri.

2. Müəllimin fəaliyyəti ilə bağlı problemlər.

3. Məktəb fənni kimi iqtisadiyyatın şagirdlər tərəfindən qavranılmasında olan problemlər.

4. İqtisadiyyatın tədrisinin maddi təminatında olan problemlər.

İqtisadiyyatın təlimində müəllim üçün əsas problemlərdən biri bu fənnin müxtəlif yaşda olan şagirdlər tərəfindən öyrənilməsi üçün motivasiya yaratmaq, dərsləri daha maraqlı və faydalı etməkdir. İqtisadiyyatın təlimi ardıcıllıq prinsipi üzrə qurulduğu üçün hər pillədə müəllim əvvəl öyrənilən məsələlərin üzərinə qayıdır, onları daha geniş, ətraflı izah edir və yeni biliklər əlavə edir. Buna görə də müəllimin əsas vəzifəsi əvvəlki məsələlərdən danışarkən təkrara yol verməmək, yeni fikirlər söyləyərək fənnin dərinliklərinə nüfuz etmək və qarşıya yeni məsələlər qoymaqdır. Beləliklə, təlimin uğurlu olması daha çox tətbiq olunan metodlardan asılıdır. Məsələlərin qarşılıqlı əlaqəsi, istifadə olunan material, müəllim izahının sürəti və keyfiyyəti kimi metodik faktorlar izah edilən konsepsiyaların mürəkkəblik dərəcəsinə təsir edir.

Dərsi daha maraqlı etmək üçün şagirdlərin qabiliyyətlərini inkişaf etdirən metodların kompleks tətbiqi məqsədəmüvafiq sayılır. Təlimin fəal metodları, xüsusən işgüzar oyunlar yalnız fənnə maraq oyatmır, həmçinin dərsin özünəməxsusluğunu artırır, qısa müddət ərzində iqtisadi situasiyanı yaşamağa, dərk etməyə, nəticələr çıxarmağa imkan verir və mükəmməl bilik əldə etməyə şərait yaradır.

Təlim prosesində oyun fəaliyyətini və onun müzakirəsini elə keçirmək lazımdır ki, şagirdlərin diqqəti oyun eksperimentinin mühüm anlarına yönəlsin.

Müxtəlif yaşlı uşaqlarda iqtisadiyyatın öyrənilməsində müxtəlif problemlər yaranır. Bəzi müəllimlər hesab edirlər ki, iqtisadiyyatı yalnız yuxarı sinif şagirdlərinə öyrətmək lazımdır, bəziləri isə hesab edir ki, bunu aşağı siniflərdən başlamaq effektli olar. Əslində hər bir müəllim iqtisadiyyat haqqında materialı uşaqlara yaş dövrünə uyğun başa salmalıdır. Bu zaman pedaqoji təhsili olmayan təhsilverənlər (iqtisadçılar) daha çox çətinlik çəkirlər. Ona görə də onların müvafiq ixtisasartırma kurslarına cəlbi zəruridir.

Əksər hallarda şagirdlər iqtisadi bilikləri sistem kimi deyil, anlaşılmayan fikirlər, mənasız qanunlar və məsələlərin həlli kimi başa düşürlər. Buna görə də iqtisadi biliklərin baza sistemini texnologiya vasitəsi ilə reallaşdırmaq zəruridir. Bunun əsasını aşağıdakı müddəalar təşkil edir:

1. Əsas iqtisadi anlayışların dərk edilməsi çox sayda faktların əzbərlənməsindən daha vacibdir.

2. Müəllim iqtisadi anlayışların qarşılıqlı əlaqəsinin şagirdlər tərəfindən daha çox dərk edilməsinə kömək etməlidir.

3. Şagirdlərə ardıcıllıq, obyektiv təhlil və özünütəhsil əsasında qurulan, təfəkkürü inkişaf etdirən üsullar təqdim edilməlidir.

Şagird yalnız materialı dinləməli deyil, eyni zamanda pedaqoji prosesin tamhüquqlu iştirakçısına çevrilməlidir.

4. İqtisadiyyat haqqında biliklərin aşkar edilməsi yalnız o zaman özünü büruzə verir ki, onlar öz həyatında bu sahəyə aid olan məsələlərdə öz biliklərini tətbiq edirlər.

Yuxarı siniflərdə iqtisadiyyatın əsaslarını praktik məşğələlərdə öyrətmək məqsədəmüvafiqdir. Bu, şagirdlərin oyun formasında istehsalçı fəaliyyətinə aid bacarıq və vərdişlər mənimsədikləri “məktəbli şirkəti” ola bilər. Bu cür məşğələlər şagirdlərdə yüksək motivasiya yaradır.

Oyunların başqa növlərini də təqdim etmək olar. Bu, iqtisadi və işgüzar oyunlardır. Onları iqtisadi təhsilin hər bir mərhələsində - ibtidai sinifdən ali məktəb tələbələrinədək tətbiq etmək olar. Bunun üçün xeyli sayda işlənmiş kompüter proqramlarından da istifadə məqsədəuyğundur.

Kadr hazırlığı problemi indiyə qədər əsas problemlərdən biri olaraq qalır. Müəllimlərin yalnız bir qismi iqtisadi biliyə malikdir. Bu fənni, əsasən, tarix və coğrafiya müəllimlərinə həvalə edirlər.

Bundan əlavə gələcəkdə məktəblərdə iqtisadiyyat kabinetinin, vəsaitlərin və sxemlərin də olması daha yaxşı olar.

Müasir dövrdə məktəblilərə iqtisadi biliklərin verilməsi zamanın tələbidir. Ona görə də onun tədrisinə yaradıcılıqla yanaşılmalıdır.

***Rəyçi: prof. A.Abbasov***

## İstifadə edilmiş ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, № 5.

2. “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu. // Azərbaycan məktəbi, 2009, № 6.

3. Rəsulov F., İbadoğlu Q. İqtisadiyyatın əsasları. Bakı: Elm, 2004.

4. Терюкова Т. Экономическое образование и проблемы профориентации школьников. // Экономика в школе, 2012, № 1.

5. Фирсов Е. Интеллектуальные игры для школьников. Экономика. Ярославль, 1998.

**Л.Курбанова**

**О преподавании экономических знаний**

**Резюме**

В статье говорится о приобретении экономических знаний учащимися начальных и высших классов. Автор касается проделанных работ и подготовки новых программ в этой области.

**L.Gurbanova**

**About teaching economy**

**Summary**

In the article it is spoken about teaching economy at primary and higher schools. The author touches upon preparing new programmes and other issues on this matter.



# DƏRSDƏ HƏYATİ SUALLAR

**Böyükağa Mikayıllı,**
***Azərbaycan Jurnalistlər Birliyinin üzvü,***
***"Təhsil və zaman" qəzetinin redaktoru***

***Açar sözlər:*** *həyati bacarıqlar, övlad-valideyn münasibətləri, sağlam mənəvi tərbiyə, həyat fenomeni.*

***Ключевые слова:*** *жизненные навыки, детско-родительских отношений, здоровое нравственное воспитание, феномен жизни.*

***Key words:*** *life skills, child-parent relationships, healthy moral education, the phenomenon of life.*

Ümumtəhsil məktəblərində "həyati bacarıqlara" əsaslanan təhsil prosesində əsas məqsəd, şagirdlərə elmin müxtəlif sahələrinə dair biliklər verilməklə yanaşı, onlarda özünün, xalqının və ümumi insanların inkişafına yönələn həyat mövqeyi formalaşdıraraq, layiqli yaşayış üçün lazımi qabiliyyət, bacarıq və vəzifələr aşılamaq, kömək etmək nəzərdə tutulmuşdur. Məktəblərimizdə bu sahədə kifayət qədər təcrübə qazanılmışdır. Təcrübəli müəllimlər öz dərsləri ilə şagirdlərin yaradıcı təfəkkürünü inkişaf etdirməklə, onların yeni biliklərə müstəqil yiyələnmələrinə şərait yaradır, onlarda biliklərini, tətbiqi vərdişlərini inkişaf etdirir. Beləliklə də, həyati əhəmiyyətli problemlərin həll edilməsinə yönələn preventiv təhsil proqramlarının reallaşması mümkün olur.

Bir dərs yalnız texnologiyanın tətbiqi ilə deyil, müəllimin ənənəviliyi və müasirliyi sintez etmək bacarığı, bu bacarığı reallaşdırmağa yardımçı olan təfəkkür genişliyi ilə zənginləşir. Bakı şəhərindəki 286 nömrəli tam orta məktəbində Samir Mehdizadənin 6-cı sinifdə "Həyati bacarıqlara əsaslanan təhsil" fakültativ kursundan apardığı dərsdə müşahidə aparmaqla müəyyən qənaətləri oxucularla bölüşməyi lazım bildik. Bu, dərsin maraqlı olduğu qədər də həyatilikdən doğan mövzusu, əslində fikirlərin tətbiqi üçün geniş imkan yaratmışdı. Əlbəttə ki, müəllim də öz növbəsində bu imkanı stimullaşdırırdı.

Tərbiyəvi əhəmiyyəti heç də az olmayan "Övlad-valideyn, şagird-müəllim" münasibətləri mövzusunun tədrisi əslində müəllimdən pedaqoji ustalıqla yanaşı, həm də zəngin həyat təcrübəsi tələb edir. Daha doğrusu, müəllim öz həyat təcrübəsini pedaqoji ustalıqla meydana qoyub həyatın bu zəruri suallarına cavab almalıdır.

Dərsdə ilk olaraq diqqəti cəlb edən müəllimin şagirdlərini mükəmməl tanıması idi. Əlbəttə ki, bu, dərs prosesində mühüm pedaqoji-psixoloji amildir. Xüsusən də həyati mövzuların tədrisində belə izahat daha ciddiliyi ilə özünü büruzə verir. Şübhə yoxdur ki, əgər müəllim hər bir şagirdini yaxından tanıyır, onun xarakteristikasını bilir, ailə mühitinə, psixoloji durumuna bələddirsə, bu amil dərs prosesinin daha səmərəli alınmasına şərait yaradacaqdır.

Samir Mehdizadənin sinfə ünvanla-

dığı suallarda bu amil özünü göstərirdi. Diqqətimi həm də o cəlb edirdi ki, Samir müəllim bir pedaqoq kimi şagirdlərinin mənəvi dünyasını görməyə, onların daxili imkanlarını aşkara çıxarıb, dərs prosesini bu imkanlar üzərində qurmaq qabiliyyətinə malikdir. O, dərsin hər bir məqamında mövzuya müvafiq olaraq mənəvi-psixoloji atmosfer yaratmaqla, şagirdini həm də gələcək haqqında düşünməyə sövq edirdi. Mövzudakı “Övlad – valideyn, şagird – müəllim” münasibətlərini Samir müəllim həyatın ən mühüm suallarından biri kimi şagirdlərinin qarşısında qoyur, problemin həlli yollarını yetirmələrinin ürəklərində axtarırdı. Əslində hər bir insanın daxili imkanları onun ürəyində, düşüncəsində gizlənmişdir. Ürəyi açmaq, onun imkanlarını meydana çıxarmaq müəllimin ustalığı ilə bağlıdır.

Samir müəllim meydana qoyduğu suallarla yalnız şagirdinin problemə münasibətini, onu nə dərəcədə mənimsədiyini aşkara çıxarmaq istəmirdi. O, həm də təhsil müəssisəsinin rəhbəri olaraq sinfin pedaqoji-psixoloji xarakteristikasını özü üçün müəyyənləşdirir, şagirdlərinin hansı ailədən, hansı mühitdən gəldiklərini aşkara çıxarırdı.

“Bizim övlad olaraq valideynlərimiz qarşısında borcumuz nədən ibarətdir?” sualı birinci mərhələdə həm də şagirdləri sınamaq məqsədi daşıyırdı. Yəni insan əgər öz valideyni qarşısında mənəvi borcunu dərk edirsə, demək, o, müəyyən mənada mənəvi hazırlığa malikdir və onunla “yola çıxmaq” olar. İkinci məqam isə sual verənlə, yəni müəllimlə əlaqədardır. Hər bir insan daşıdığı vəzifəyə, danışdığı sözə, irəli sürdüyü fikrə mənəvi cəhətdən də hazır olmalıdır. Əgər bu hazırlıq olmazsa, danışılan söz, irəli sürülən fikir heç bir əhəmiyyət daşımaz. O fikrin heç bir təsir qüvvəsi də olmaz. Müəllim şagirdi qarşısında, cəmiyyət arasında elə bir mənəviyyata malik insan kimi tanınmalıdır ki, onun hər bir sözü ürəklərə, düşüncələrə ən qiymətli inci kimi yazıla bilsin. Samir müəllimin yetirmələrinin simasından müəllimlərinə bu rəğbəti və ehtiramı hər an oxumaq olur. Məhz bu məqam, ən mühüm pedaqoji məqam kimi dəyərləndirilə bilər. Ehtiram yaratmadan öyrətmək mümkün deyildir. Müasir dövrümüzdə, müəllim nüfuzunun hər yerdə müzakirə olunduğu bir dönəmdə müəllimə yüksək ehtiram göstərmək, sözsüz ki, müsbət haldır.

İndi isə birinci sualın cavabına diqqət yetirək: “Biz valideynlərimizin borcunu qaytara bilmərik, amma onlara olan ehtiramımızla öz övladlıq borcumuzu yerinə yetirə bilərik”. Dərs prosesində sevindirici mühüm məqamlardan biri də o idi ki, şagirdlərin cavablarından mərhəmətlilik, xeyirxahlıq, sevgi duyğuları sezilirdi. Ümumiyyətlə, dərsi mərhəmət dərsi adlandırmaq daha düzgün olardı. Samir müəllimin ünvanladığı sualların cavablarından boy verən bu hiss şagirdlərin qəlbinin mərhəmət səsi kimi eşidilirdi. Bu səs onları həm də vətəndaşlıq qəyəsinə kökləyirdi. Ailədən təməli qoyulan sağlam mənəvi tərbiyə bir ömür boyunca onlara yol yoldaşlığı edəcək, onların cəmiyyətdə yerini müəyyənləşdirəcək, onları bir insan kimi göstərəcəkdir. Əgər belə demək mümkünsə, Samir Mehdizadə həyatın reallıqlarını yetirmələrinin düşüncəsi önündə vərəq-vərəq açıb, bunu onların özlərinə oxudurdu. Onlar həyat həqiqətlərini özləri kəşf edir, bu kəşflə yeni düşüncə dünyası ilə qarşılaşırdılar. Beləliklə, müəllim uşaqlara hər hansı biliyi öyrətməklə, o bilikləri sistemli şəkildə

tədris edir. Yeni pedaqoji təfəkkür köhnə sistemin daxilində onun qüsurlarından ibarət dərsi ala-ala formalaşır. Bunlar isə yeni keyfiyyətlərin yaranmasına stimul verir.

Onlar məqsədə doğru addım-addım gedirdilər. Aldıqları fərdi tapşırıq ilk addım idi. Bəs Samir Mehdizadə niyə məhz şagirdlərini öncə fərdi tapşırıqla sınağa çəkirdi? Niyə hər şeydən öncə yetirmələrinin tək işləyə bilmək bacarıqlarını yoxlayırdı. Əlbəttə, o, bu addımı atmaqla birinci növbədə şagirdlərinin müstəqil fikir yürütmək bacarıqlarını müəyyənləşdirmək məqsədi daşıyırdı. İnsan o zaman öyrənir, o zaman dərk edir ki, onun təfəkkür azadlığı, düşüncə sərbəstliyi olsun. Azad olmayan düşüncələrdən, sıxıntılı beyinlərdən mütərəqqi ideyalar, fikirlər doğulmaz. Necə ki, burada, ünvanlanan sualların cavablarından ideyallıq görürdü. Sual belə idi: "Dostunuz valideyninizin xoşuna gəlirmi?" Cavablar haqqında konkret danışmağa ehtiyac yoxdur. Ancaq onu demək olar ki, şagirdlərin cavabları insanın insana dəyər verməsi, dostun dostu xarakterizə etməsi, cəmiyyətin qanunauyğunluqları baxımından müzakirə edilməsi çox təqdirəlayiq idi. Ən əhəmiyyətli cəhət isə, fikir və düşüncələrdəki azadlıq meyilləri, düşüncə, təfəkkür nəticəsi olması etibarilə xarakterik idi. Cavablardan həm də obyektivlik meyilləri duyulurdu. Hiss olunurdu ki, siniflə ümumilikdə aparılan tərbiyəvi pedaqoji-psixoloji iş şagirdlərin mənəvi tərbiyəsində hərtərəfli müsbət rol oynayır. Sağlam düşüncə, bütöv əqidə, şəxsiyyət kamilliyi bu yeniyetmələrin həyat amalları kimi gözə çarpırdı.

Samir Mehdizadənin növbəti sualı "cütlər" tərəfindən cavablandırılmalı idi. Sualın məzmununa diqqət yetirək: "Valideynlərinizlə hər hansı bir səbəbdən mübahisəniz olubmu?" Bu sual məzmun və mahiyyət etibarilə birinci sualdan daha ciddi səslənmişdi. Bu sualın cavabından artıq, şagirdin özünün mənəvi tərbiyəsi ilə yanaşı, ailə mühiti, ailənin cəmiyyətdəki mövqeyi, valideynlərin xarakterik xüsusiyyətləri meydana çıxacaqdı. Cavablar haqlı olduğumu sübut edirdi. Hətta bir az daha irəli getsək deyə bilərik ki, cavablar ailələrin mədəni səviyyəsini, əxlaqi-mənəvi durumunu da xarakterizə edirdi. Əslində şagirdlər cavabları ilə həyat gerçəkliklərini, cəmiyyətin reallıqlarını xarakterizə edirdilər. Lakin hələ bu da müəllimin son məqsədi deyildi. Mövzunun ikinci hissəsi: şagird-müəllim münasibətlərindən bəhs etməklə, şagirdin cəmiyyətə baxışının müəyyənləşməsinə xidmət edirdi. Samir müəllim irəli sürdüyü suallarla şagirdinin düşüncəsindəki müəllimin obrazını açırdı. Onlar dərk edirdilər ki, yeniyetmələrin, gənclərin həyatında valideyni qədər mühüm rola malik olan bir insan da var: o, müəllimdir. Nahaq yerə demirlər ki, müəllim ikinci valideyndir. Türk dünyasının böyük oğlu Mustafa Kamal Atatürk söyləyirdi ki, cismimin sahibi atam Əli Rza əfəndi, fikir və düşüncələrimin sahibi isə müəllimim Ziya Göyalpdır.

Samir müəllimin ünvanladığı suallara rəğmən almaq istədiyi cavablarda şərəfli müəllimlik peşəsinə böyük ehtiram duyulur-

du. O da duyulurdu ki, şagirdlərin müəllimliyə olan sevgisi həm də ailədən qaynaqlanır. Əgər fikirlərin bir tərəfində, tərəzinin bir gözündə valideyn dayanırdısa, digər tərəfdə eyni mahiyyət daşıyan müəllim dayanırdı. Təlimdə, tərbiyədə o zaman yüksək nəticədən danışmaq mümkündür ki, ailə və məktəb vəhdətdə fəaliyyət göstərsinlər. Əslində şagirdlərin bu nəticəyə gəlməsi bir neçə cəhətdən xarakterik idi. Və bu xarakterizmi dərsin mahiyyəti, ruhu da hesab etmək olardı. Bu da ondan ibarətdir ki, bütün sinfi işlətməyə nail olan müəllim nəticəyə də onlarla birlikdə gəlmişdi. Bu nəticə isə yeniyetmələrin gələcək həyatında mühüm rola malik olan valideyn, müəllim zəhmətinin, bu zəhmətə olan ehtiramın dərk olunması idi. Samir müəllim yetirmələrinə bu ehtiramı aşılamaqla, həyat fenomenini dərsin baş roluna gətirə bilmiş və yetirmələrində ona sevgi aşılaya bilmişdi.

***Rəyçi: prof. Ə.Ağayev***

## İstifadə edilmiş ədəbiyyat

1. Komenski Y. Böyük didaktika. Bakı, 2012.
2. Ağayev Ə. Seçilmiş pedaqoji əsərlər. I cild. Bakı, 2011.
3. Süleymanova A. Təhsilin əsasları. Bakı: Təhsil, 2014.
4. Abdulov R. Məktəbdə sosial pedaqoji işin təşkili. Bakı, 2005.
5. Мудрик А. Социальная педагогика. Москва, 2002.
6. Cəbrayılov İ. Şəxsiyyətyönümlü təhsil və vətəndaş cəmiyyəti. Bakı, 2011.
7. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları. Bakı: Təhsil, 2008.
8. Hacıyeva H., Axundova S. Həyat bilgisinin tədrisində əyləncəli oyunlar vasitəsilə fənlərarası əlaqənin yaradılması. Bakı, 2009.
9. Hacıyeva H., Məhərrəmov Ə. Ətraf aləmlə tanışlığın tədrisi metodikası. Bakı: Araz, 2007.
10. Тутюков Ю. Основы педагогической технологии. Москва: Просвещение, 2001.
11. Həyati bacarıqlara əsaslanan təhsil. Bakı, 2006.

**Б.Микаилли**

**Жизненные вопросы на уроке**

**Резюме**

В статье говорится о передовом опыте педагога 286-ой школы С.Мехтизаде. Статья анализируют успешное обучение, основанное на жизненных навыках.

**B.Mikhailli**

**The lesson about life issues**

**Summary**

The article is dedicated to the professional teacher S.Mehdizadeh’s work experience who teaches at school No.286. The author also analyses the issues of successful training which based on developing life skills education.



# QAZAXISTAN TƏMSİLÇİLƏRİ BİRİNCİ TÜRKOLOJİ QURULTAYDA

**Ağahüseyn Şükürov,**
***filologiya üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *qurultay, türkologiya, Azərbaycan, qazax, türkdilli, əlifba.*
***Ключевые слова:*** *съезд, тюркология, Азербайджан, казахский, тюркоязычный, азбука.*
***Key words:*** *congress, turkology, Azerbaijan, khazakh, turkish speaking, alphabet.*

1926-cı ildə fevralın 26-dan – martın 6-dək keçirilmiş Birinci Türkoloji Qurultayın materialları [1] türk xalqları ədəbiyyatı tarixinin öyrənilməsində böyük əhəmiyyət kəsb edir. Bakıdakı "İsmailiyyə" binasında (hazırda AMEA Rəyasət Heyətinin binası – A.Ş.) keçirilən qurultay ümumtürk ədəbi dili, əlifba, termin məsələləri, eləcə də tarix, arxeologiya və ədəbiyyat sahələrinin bir sıra istiqamətlərini əhatə edən çox mühüm hadisə kimi tarixə düşmüşdür.

"Birinci Türkoloji Qurultayın həm keçirildiyi dövrdə, həm də sonralar türk dünyasında türkoloji təfəkkürün inkişafına təsir gücü, görünür, heç bir türkoloji forumla müqayisə oluna bilməz. Bütün 20-ci, 30-cu illər bu qurultayın doğurduğu ovqat altında keçmişdir.

Bütün türklər üçün ortaq dil, ədəbiyyat, tarix və s. axtarışları, daha doğrusu, genetipoloji (təbii) olaraq mövcud ortaqlıqların müdafiəsi, yaxud aktuallaşdırılması Birinci Türkoloji Qurultayın əsas missiyası olmuşdur.

Birinci Türkoloji Qurultayın qərarları (və ümumiyyətlə, ruhu), bu gün də aktualdır. Ancaq təbii ki, yeni tarixi şəraitin, müasir dövrün, qloballaşan dünyanın tələbləri səviyyəsində... Həmin tələblərə isə ilk növbədə həm müstəqil dövləti olan, həm yarımmüstəqil (bu və ya digər dövlət tərkibində muxtariyyəti tanınan), həm də qeyri-müstəqil türk xalqları arasında mənəvi-mədəni əlaqələrin intensivliyinin gücləndirilməsi, bunu ardıcıl təmin edəcək təşkilati işlərin sürətləndirilərək müvafiq (mədəni, akademik, siyasi-ideoloji və s.) qurumların yaradılması daxildir. Ən təxirəsalınmaz məsələlərdən biri də həmin qurumların beynəlxalq sferada fəaliyyət göstərməsi, transmilli təşkilat, hərəkat və proqramlarla ardıcıl əməkdaşlığıdır" (Nizami Cəfərov).

Azərbaycan Prezidenti İlham Əliyevin Birinci Türkoloji Qurultayın 80 illiyi ilə bağlı 9 noyabr 2005-ci il tarixli [2], "Birinci Türkoloji Qurultayın 90 illik yubileyinin keçirilməsi haqqında" 18 fevral 2016-cı il tarixli sərəncamları [3] bu tarixi forumun türk xalqlarının həyatında necə böyük tarixi əhəmiyyət daşıdığını bir daha təsdiq edir. Dövlət başçısı tərəfindən imzalanmış hər iki sərəncam bu gün türkdilli respublikalar arasında elmi-mədəni əlaqələrin inkişaf etdirilməsində mühüm əhəmiyyətə malikdir.

2016-cı ildə türkdilli respublikalarda Birinci Türkoloji Qurultayın möhtəşəm yubiley mərasimləri keçirilir. 23-25 may tarixlərində Qazaxıstanın paytaxtı Astana

şəhərində keçirilmiş “Böyük Çöl” Birinci Beynəlxalq Humanitar Forumunu buna misal göstərmək olar [4]. Türkiyədə (Ankara), Macarıstanda (Budapeşt), Tatarıstanda (Kazan) da qurultayın yubileyi beynəlxalq elmi konfranslarla qeyd edilmişdir. Yekun yubiley tədbiri isə noyabrın 13-15-də Azərbaycan Milli Elmlər Akademiyasının təşkilatçılığı ilə Bakı şəhərində keçirildi.

Məlum olduğu kimi, Birinci Türkoloji Qurultayda 131 nümayəndə iştirak etmişdir. Sonradan 120-yə yaxın iştirakçısının, seçmə alim və mütəfəkkirin əksəriyyətinin həbsi və fiziki məhvi ilə bitən bu qurultay türkologiya elminin müxtəlif istiqamətlər üzrə öyrənilməsi baxımından mühüm mərhələ kimi dəyərləndirilir.

Tarixi qurultayda doqquz gün ərzində 17 iclas keçirilmiş, türk dünyasının dilinə, tarixinə, ədəbiyyat və mədəniyyətinə və s. həsr olunmuş 29 məruzə dinlənilmişdir. İsmayıl bəy Qaspıralı və Vasili Radlovun şərəfinə keçirilməsi qərarlaşdırılan qurultay, artıq qeyd olunduğu kimi, türk xalqlarının ədəbi-mədəni həyatında mühüm əhəmiyyətə malikdir. Dünya türkologiya elminin məşhur simaları olan görkəmli şərqşünas alimlərin tədbirdə iştirakı və məruzələrlə çıxış etmələri Birinci Türkoloji Qurultayın elmi-tarixi mahiyyətini daha da artırmışdır.

Türkdilli xalqların qarşılıqlı ədəbi əlaqələrinin daha da genişləndirilməsinə stimul yaratmış Birinci Türkoloji Qurultay türkologiya problemlərinin öyrənilməsində misilsiz əhəmiyyətə malik olmuşdur. XX əsrin məşhur rus şərqşünas alimi, görkəmli dilçi və türkoloq Andrey Kononov “Qurultayın qərarlarının öz elmi əhəmiyyətini bu gün də itirmədiyini” xüsusi qeyd etmişdir [5].

Qurultay türk tarixinin, türk etnoqrafiyasının, türk təsviri sənətinin öyrənilməsi ilə bağlı məruzələr, çıxışlar elmi dəyəri və bu gün də əhəmiyyətini itirməyən elmi sanbalı ilə seçilir.

İndiyədək qurultayın məram və məqsədi, tarixi əhəmiyyəti, ayrı-ayrı türk xalqlarının filoloji tarixinin öyrənilməsi və digər bir çox məsələlər barədə müxtəlif ədəbi-elmi qaynaqlarda, kütləvi elmi tədbirlərdə ətraflı bəhs olunmuş, türkoloq dilçi və filoloq alimlərin elmi, elmi-nəzəri müddəaları öz əksini tapmışdır.

Birinci Türkoloji Qurultayın böyük coşqu və mütəşəkkilliklə davam edən əks-sədası böyük bir coğrafiyanı əhatə edirdi. 1927-ci ildə Krımda, 1928-ci ildə Səmərqənddə, 1930-cu ildə Almatıda imla konfransları, 1932-ci ildən başlayaraq keçirilən Türk Dili Konqresləri, 1976-cı ildə Almatıda, 1980-ci ildə Daşkənddə, 1988-ci ildə Aşqabadda keçirilən sovet türkoloji konqresləri Birinci Türkoloji Qurultayın təsiri ilə keçirilmiş mühüm elmi tədbirlərdir. Bu tədbirlər türkologiyanın müxtəlif istiqamətlər üzrə inkişafına böyük töhfələr vermişdir ki, bu inkişafda da bütün türkdilli xalqların nümayəndələri kimi qazax xalqının görkəmli alimlərinin də xüsusi payı vardır.

Digər türkdilli xalqların nümayəndələri ilə yanaşı, qurultayda iştirak etmiş və müxtəlif mövzularda çıxışları dinlənilmiş Qazaxıstan nümayəndələri Birinci Türkoloji Qurultayda 4 nümayəndə ilə təmsil olunmuşdur. Nazir Torekulov adlı daha bir qazax isə tədbirə Moskvadan dəvət edilmişdi. Beləliklə, qurultayda iştirak edən 5 nəfər qazax – məşhur maarifçi, dilçi alimlər, öz ölkələrində yeni əlifba siyasətinin görkəmli nümayəndələri Əhməd Baytursunov (1872-1937), Bilal Suleyev (1893-1937), Eldes Omarov (1892-1937), Əziz Bayseyidov (1893-1955) və Nazir Torekulov (1892-1937) olmuşlar.

Onlar kim idilər? Qazax xalqının tarixində misilsiz xidmətləri ilə iz salmış bu görkəmli şəxsiyyətlərin keçdiyi həyat yolu-

na qısaca nəzər salaq:

İctimai-siyasi xadim, maarifçi, linqvist alim, ədəbiyyatşünas, türkoloq, tərcüməçi olan Əhməd Baytursunov (5 sentyabr 1872-1937) parlaq ədəbiyyatşünas və pedaqoq kimi tanınmışdır. O, ilk təhsilini aul mollaxanasında oxumuş, burada əlaçı şagird kimi tanınmışdır. Sonra Turqay ikisinifli rus-qazax məktəbində təhsil almışdır. Daha sonra Orenburqa gedərək təhsilini davam etdirmək məqsədilə görkəmli maarifçi İbray Altınsarin tərəfindən əsası qoyulmuş dördillik müəllimlər seminariyasına daxil olmuşdur. Əhməd Baytursunov əzab-əziyyətə, böyük maddi çətinliklərə baxmayaraq, 1895-ci ildə məktəbi bitirmiş və o vaxtdan 1909-cu ilədək Aktübinsk, Kustanay və Qarqaralı uyezdlərinin aul volost məktəblərində müəllimlik etmişdir. Kustanay uyezdində işlədiyi zaman meşəbəyinin evində yaşayan Əhməd onun qızı Aleksandra ilə evlənir. Müsəlman adəti ilə ailə quran cütlüyün xanımı ərinin soyadını götürüb adını da dəyişərək Badrisəfa Məhəmmədsadıq qızı Baytursunova kimi tanınır. Kustanayda məskunlaşan ailə sonradan Omska, daha sonra Qarqaralıya köçərək 1909-cu ilədək burada yaşayır. Əhməd Baytursunov 1907-ci ildə çar üsuli-idarəsini tənqid etdiyinə görə həbs olunur və iki ildən sonra ikinci dəfə tutularaq məhkəməsiz 8 ay müddətinə azadlıqdan məhrum edilərək Semipalatinsk həbsxanasına göndərilir. 1905-ci ildə siyasi fəaliyyətə başlayan Əhməd Baytursunov bir müddətdən sonra məsləkdaşı ilə Orenburqda “Qazax” qəzetini açır və 5 il müddətində bu qəzet əsas milli ictimai-siyasi və elmi-ədəbi nəşr kimi tanınır. 1917-ci ildə “Alaş” qazax partiyasının və Alaş-Orda hökumətinin yaradıcılarından və rəhbərlərindən biri kimi tanınsa da, təşkilat bağlandıqdan sonra sovet hakimiyyəti tərəfinə keçərək bir sıra vəzifələrdə çalışır.

Rusiya Kommunist (bolşeviklər) Partiyasının üzvlüyünə namizəd qəbul edilən Əhməd Baytursunov 1919-cu il aprelin 24-də qurulan RSFSR Xalq Hərbi Komissarlığı yanındakı Qırğız (Qazax) bölgəsini idarə edəcək Hərbi İnqilab Komitəsinə üzv təyin olunur. Bolşeviklər hakimiyyətə gələndən sonra o, Qazaxıstan MSSR maarif naziri təyin olunur. Əhməd Baytursunov Mərkəzi Komitədə, Qazaxıstan MSSR Mərkəzi İcraiyyə Komitəsində müxtəlif vəzifələrdə və Türküstan Kommunist Partiyası Mərkəzi Komitəsinin orqanı “Ak jol” (“Ağ yol”) qəzetində işləyə-işləyə elmi-pedaqoji fəaliyyətini də davam etdirir. 1926-cı ildə onu partiya üzvlüyündən və vəzifədən azad edirlər. 1929-cu ildə keçmiş siyasi fəaliyyətinə görə NKVD tərəfindən həbs olunaraq Arxangelsk vilayətinə sürgün olunur, arvadı isə qızlığa götürdükləri Şolpanla birlikdə Tomska göndərilir. 1934-cü ildə Maksim Qorkinin arvadının müdaxiləsi ilə həbsdən azad edilir və sonradan yenə də ailəsi ilə birgə – artıq övladlığa götürdüyü 3 uşaqla birlikdə Alma-Ataya köçür (burada yaşadığı ev sonradan muzeyə çevrilmişdir – A.Ş.). 1937-ci ilin oktyabr ayında yenidən həbs edilən Əhməd Baytursunov iki aydan sonra – dekabrın 8-də “xalq düşməni” adı ilə güllələnir. Yalnız ölümündən 51 il sonra – 1988-ci ildə ona bəraət verilir.

Əhməd Baytursunovun yaradıcılığı bir sıra mühüm hadisələrlə zəngindir. 1896-cı ildə qazax çöllərini gəzərək folklor nümunələrini toplayan, qazax xalqının etnoqrafiyasını, dialektlərini öyrənən çuvaş araşdırıcısı Alektorovla tanışlıq gənc Əhmədin dünyagörüşündə böyük dəyişiklik yaradır. Vətənini hədsiz məhəbbətlə sevən Əhməd xalqının yaşam tərzini öyrənir, folklorunu toplayır, uşaqların daha yaxşı təhsil alması, biliklərə tez yiyələnməsi üçün forma və metodlar axtarır. Yeniyetmə yaşlarında

dombra çalmağa böyük maraq göstərən Əhməd həm də qazaxların jır adlandırdığı xalq mahnılarının toplanması ilə məşğul olur [6].

Baytursunov qazax əlifbasını ərəb qrafikası əsasında yenidən işləyərək tarixi islahat aparmışdır. 1912-ci ildə qazax dilində işlənməyən ərəb hərflərini əlifbadan çıxararaq, onları doğma dilə uyğunlaşan hərflərlə əvəzləmişdir. “Jan emle” (“Yeni orfoqrafiya”) adını almış bu əlifba indi də Çin, Əfqanıstan və İranda yaşayan qazaxlar tərəfindən istifadə olunur [7].

Görkəmli xadim, parlaq maarifçi, qazax, rus, tatar dillərini səlis bilən Bilal Suleyev Qazaxıstanda təhsil sisteminin əsas yaradıcılarından biridir. Bilal Suleyev Orenburqda müəllimlər seminariyasını bitirdikdən sonra bir müddət müəllim işləmişdir. 1918-ci ildə dövrün görkəmli ziyalı xanımı, maarifçi, pedaqoq, şair və yazıçı, rus, alman və fransız dillərinin gözəl bilicisi tatar qızı Fatimə Qaibova ilə ailə həyatı qurmuşdur. Bilal Suleyev tanınmış maarif işçisi idi. 1923-cü ildə Kommunist Partiyasına qəbul olunduqdan sonra təhsil və maarifçilik sahəsində məsul vəzifələrdə işləmişdir. 1920-1929-cu illərdə Semireçye xalq təhsili şöbəsinin müdiri kimi vilayətin bütün yaşayış məntəqələrində məktəb və internatların açılışını təşkil etmişdir. 1928-ci ildə Qazaxıstan Xalq Maarif Komissarlığının məsul işçisi kimi Bilal Suleyev Uraz Candosovla birlikdə Qazaxıstanda ilk universitetin açılmasına böyük əmək sərf etmişdir. Bilal və Fatimənin qızı Fəridə 1919-cu ildə, oğlu Janibek isə (1943-cü ildə Böyük Vətən müharibəsində həlak olmuşdur) 1923-cü ildə dünyaya gəlmişlər. 1929-cu ildə Suleyevlər ailəsi Aktübinskə köçdükdən sonra Bilal vilayət xalq təhsili şöbəsinin müdiri işləmişdir. 1930-cu ilin qışında 10 yaşlı Fəridənin dünyadan köçməsi ailəyə böyük kədər gətirmişdir. Sonra ailə Semipalatinskə köçmüş, Bilal Suleyev burada pedaqoji institutun rektoru vəzifəsində çalışmışdır. 1930-cu ildə Azat adlı oğlu dünyaya gəlmişdir. 1931-ci ildə millətçilikdə təqsirləndirilərək həbs edilən Bilal Suleyev 1932-ci ildə azadlığa buraxılmışdır. Bundan sonra o, Moskvaya getmiş, istehsalatda çalışaraq maarifçilik fəaliyyətini davam etdirmişdir. Məhz bu zaman Fatimə iki övladı ilə birlikdə Semipalatinskdən Alma-Ata şəhərinə köçmüşdür (Lakin onlar 1932-ci ildə boşanmışlar. Fatimə Qaibova sonradan şair, Qazaxıstan SSR Yazıçılar İttifaqının sədri İlyas Cansuqurovla (o da iftira ilə 1937-ci ildə tutulmuş, 1938-ci ilin fevral ayında “yapon casusu” adı ilə güllələnmişdir), üçüncü dəfə isə məşhur qazax yazıçısı Muxtar Auezovla ailə qurmuşdur). 1934-cü ildə Qaraqalpak MSSR-in Nukus şəhərinə ali təhsil müəssisələri və orta məktəblər şöbəsinə müdirlik etmək məqsədilə Moskvadan göndərilmiş Bilal Suleyev 1937-ci ildə NKVD tərəfindən yenidən həbs edilmiş və repressiya olunmuşdur. Yalnız 1958-ci ildə Qazaxıstan SSR Ali Məhkəməsi tərəfindən bəraət almışdır [8].

Görkəmli ictimai xadim, publisist, tərcüməçi, alim-linqvist Eldes Omarov 29 fevral (bəzi mənbələrdə 1mart) 1892-ci ildə Kustanay vilayətinin Semiozernıy rayonunun Kojay aulunda anadan olmuşdur. Əvvəlcə aul mollaxanasında təhsil almış, sonra Kustanay ikisinifli rus-qazax məktəbini fərqlənmə ilə bitirmişdir. Orenburq qırğız məktəbini bitirdikdən sonra Komek volostunun Dobay aulunda müəllimlik etmişdir. 1917-ci ildə dərslik hazırlayan komissiyanın üzvü seçilən Eldes Omarov Orenburqda nəşr edilən məşhur “Qazax” qəzetinin fəal müəlliflərindən biri kimi də tanınmışdır. Vətəndaş müharibəsi illərində Alaş-Ordanın Kustanay uyezdi üzrə sədri və uyezdin komissarı olmuşdur. 1920-ci illərin əvvəllərindən Orenburq xalq təhsili

komissarlığının məktəb şöbəsində işləyən Eldes Omarov Qazax Xalq Təhsili İnstitutunda dərs demiş, məktəblilər üçün dərslik yazmışdır. O, Alma-Ata şəhərində yaşayıb fəaliyyət göstərmiş və Alaş-Orda muxtariyyətinin yaradılması proqramının müəlliflərindən biri olmuşdur.

Sonradan özü kimi "vətən xaini" damğası vurulmuş Əhməd Baytursunov, Miryakıb Dulatov, Muxtar Murzin, Jusibbek Aymautovla dostluq etmişdir. Doğma vətənini dərin məhəbbətlə sevən Eldes Omarov qazax yazısının ərəb qrafikası əsasında işlənməsinin tərəfdarı olmuşdur. O, bu barədə Birinci Türkoloji Qurultayda da bildirmişdir. Qazax şifahi ədəbiyyatının mahir bilicisi kimi tanınmış Eldes Omarovu müasirləri "qazaxların Lomonosovu" adlandırmışlar. Riyaziyyat, cəbr, fizika, triqonometriya, həndəsə üzrə çoxsaylı dərsliklərin müəllifi olmuş Eldes Omarov balacalar üçün atalar sözləri və məsəllər, xalq yaradıcılığı nümunələrini əhatə edən əlifba ("Alippe") dərsliyi hazırlasa da, nəşrinə nail ola bilməmişdir. O, görkəmli qazax yazıçısı Muxtar Auezovun elmi fəaliyyətinin ilk tədqiqatçılarından biri olmuşdur.

Eldes Omarovun həyatı daima məhrumiyyətlərdə keçmiş, dəfələrlə həbs olunmuşdur. Birinci dəfə ona 10 il həbs cəzası kəsilmiş, Kareliya meşələrində sürgün həyatı yaşamışdır. 1933-cü ildə sürgündən vaxtından qabaq azad olunaraq bir müddət Tibb İnstitutunda, sonra isə Qazaxıstan Dövlət Universitetində dərs demiş, yeni dərsliklər üzərində yorulmadan çalışmışdır. Həkimlər üçün qazax dili dərsliyinin hazırlanması ona tapşırılmışdır. 22 noyabr 1937-ci ildə yenidən tutularaq dekabrın 1-də barəsində ölüm hökmü çıxarılmış, 1937-ci ildə güllələnmişdir. 25 may 1989-cu ildə qazax xalqının görkəmli oğlu Eldes Omarova Alma-Ata prokurorluğu tərəfindən bəraət verilmişdir.

Görkəmli ictimai-siyasi xadim, dilçi və diplomat, publisist, filoloq, Sovet İttifaqının Səudiyyə Ərəbistanında ilk səfiri olmuş Nazir Torekulov 1892-ci ildə Fərqanə vilayətində anadan olmuşdur. Kokandda "Cədid" mədrəsəsində və rus-tuzem məktəbində ibtidai təhsil almış, burada səkkizillik kommersiya məktəbində oxumuş, 1914-1916-cı illərdə Moskva Kommersiya İnstitutunun iqtisadiyyat fakültəsini bitirmişdir. O, çar Rusiyasının əsarətində olması ilə Türküstanın nə qədər məhrumiyyətlərə düçar olduğunu gözəl anlayırdı. Bu fikrini məruzə və çıxışlarında, çap olunmuş kitablarında dəfələrlə açıq-açığına bildirirdi. Çar hökuməti və bolşeviklər Türküstanı Rusiyanın xammal məkanı hesab edirdi. Bir sıra qəzet və jurnalların (məsələn, "Xalık qazetası", "İnkilob" jurnalı və s.) yaradılmasında, eləcə də redaktə olunması və nəşrində fəal iştirak etmiş Nazir Torekulov diyarın müsəlman bürosunun orqanı olan "İştrati-İyun" qəzetinin redaktoru olmuşdur. Çoxmillətli Türküstan Respublikasının siyasi həyatında vacib post tutan Nazir Torekulov Türküstan KP MK-nın birinci katibi seçilmiş (1920), respublikanın Mərkəzi İcraiyyə Komitəsinə başçılıq etmişdir (1921-1922). Onun köməkliyi ilə Daşkənddə ilk qazax ali məktəbi açılmışdır. Yüksək vəzifələrdə çalışdığı vaxt təkcə siyasi sahədə deyil, mədəniyyət sferasında da xeyli işlər görmüşdü. 1920-ci illərin əvvəllərində müsəlmanların ən əziz bayramı olan Qurban bayramının (Kurban-ayta) üç gün bayram edilməsi ilə bağlı fərman vermişdir. 1922-1926-cı illərdə Moskvada işləmiş, SSRİ xalqlarının nəşriyyatına başçılıq etmiş, eyni zamanda Şərq Zəhmətkeşləri Universitetində mühazirələr oxuyaraq elmi-pedaqoji fəaliyyətlə məşğul olmuşdur. 36 yaşında o dövr üçün çox nadir hadisə sayılan Səudiyyə Ərəbistanının Səfirliyində fəaliyyətə başlamış, cəmi iki ildən sonra səfir kimi

irəli çəkilmişdir. 8 il SSRİ-ni bu ərəb ölkəsində təmsil etmiş Nazir Torekulov Sovet İttifaqının Əfqanıstan, Türkiyə, İran, İraq, Suriya, İordaniya ilə dostluq əlaqələrinin qurulmasında yaxından iştirak etmişdir. Ümumittifaq yeni türk əlifbası komissiyasının sədri kimi yeni türk əlifbası layihəsinin müəllifi olmuşdur.

Alaş-Ordaçıları dəstəklədiyinə görə, millətçilikdə təqsirləndirilərək, 3 oktyabr 1937-ci ildə repressiya olunaraq güllələnmişdir. 28 yanvar 1958-ci ildə bəraət almışdır.

Əziz Bayseyidov 1893-cü ildə Semipalatinsk vilayətinin Zaysan uyezdində anadan olmuşdur. Zaysan yeddiillik ibtidaiali məktəbini və Türkiyədə səkkizillik müəllimlər seminariyasını bitirmişdir.

1924-cü ildən Kommunist Partiyası sıralarına daxil olan Əziz Bayseyidov 26 yaşından müəllimlik fəaliyyəti ilə məşğul olmuşdur. Daşkənd Qazax Maarif İnstitutunda (1919-1920) və Birinci dərəcəli Aul-Ata məktəbində (1920-1921) müəllim, Aul-Ata Kənd Təsərrüfatı Texnikumunun müdiri (1921-1922), Aul-Ata “Koşçi” Yoxsullar İttifaqının katibi, sədri (1922-1923), Aul-Ata Xalq Təhsili Şöbəsinin müdiri (1923-1924), Sırdərya Maarif Şöbəsinin inspektoru (1924-1925), Qazaxıstan SSR Xalq Maarif Komissarlığı Akademik Mərkəzinin diyar instruktor məktəbinin müdiri (1926-1927) vəzifələrində işləmişdir. Semipalatinsk Şəhər Avtoyol Texnikumunu yaratmış, 1935-ci ilədək texnikumun direktoru olmuşdur.

Əziz Bayseyidov əks-inqilabi millətçi qruplaşmaların təşkilində təqsirli bilinmiş, 1935-ci il dekabrın 28-də tutularaq 1937-ci ildə mühakimə olunmuşdur. Bu zaman hamilə olan həyat yoldaşı üç qızı ilə birlikdə Karaqanda vilayətinin Ulutau kəndinə – ərinin qohumlarının yanına köçmüşdür. 5 il islah-əmək düşərgəsində cəza çəksə də, müharibənin başlanması ilə əlaqədar olaraq həbs müddəti 1945-ci ilədək uzadılmışdır. Yalnız 19 yanvar 1957-ci ildə əməlində cinayət tərkibi olmadığına görə bəraət almışdır. 1949-cu ilədək Karaqanda vilayəti Ulutau rayon yol şöbəsində işləmişdir. 1949-cu il mayın 3-də “xalq düşməni” kimi yenidən həbs edilərək 10 il həbs cəzası almış, Kolıma və Maqadana sürgün olunmuşdur. Cinayəti sübuta yetiril-mədiyinə görə, 1954-cü ildə Əziz Bayseyidov yenidən bəraət qazanmışdır. 1955-ci ildə azad olunaraq ailəsinin yanına qayıtsa da, bir neçə aydan sonra dünyasını dəyişmişdir. Yalnız 2003-cü ildə Şərqi Qazaxıstan Vilayətinin prokurorluğu tərəfindən əməlində cinayət tərkibinin olmaması sübuta yetirilmiş Əziz Bayseyidov repressiya qurbanı hesab edilərək bəraət qazanmışdır.

Göründüyü kimi, Birinci Türkoloji Qurultay nümayəndələrinin böyük əksəriyyəti kimi, tədbirdə təmsil olunmuş və müxtəlif səpkili elmi müzakirələrdə yaxından iştirak etmiş 5 nəfər qazax mütəfəkkiri də repressiyaya məruz qalmış, yalnız ölümlərindən sonra bəraət qazanmışlar.

Beləliklə, Birinci Türkoloji Qurultayın ümumi fəaliyyətinə və bu mötəbər tədbirdə iştirak etmiş qazax alimlərinin həyat yoluna nəzər saldıq. Qazax xalqının görkəmli ziyalıları Əhməd Baytursunov, Bilal Suleyev, Eldes Omarov, Əziz Bayseyidov, Nazir Torekulov nə qədər məşəqqətli həyat sürsələr də, hər cür məhrumiyyətə düçar olsalar da, daim qazax xalqının maariflənməsi yolunda əsl fədakarlıq göstərmiş, hər zaman öz məslələri uğrunda mübarizə aparmışlar. Qısa ömürlərində bir sıra dövlət vəzifələrində az müddətdə fəaliyyət göstərsələr də, onlar öz əqidələrinə sadiq qalaraq, xalqın maariflənməsi yolunda canlarını fəda etmişlər. Birinci Türkoloji Qurultaya gələndə də onların məqsəd və məramı aydın idi: öz aydınlıqlarını və ziyalılıqlarını qazax xalqının maariflənməsinə yönəltməklə,

ümumilikdə türk dünyasının aydınlığına xidmət göstərmək və xalqın mənafeyini hər şeydən üstün tutmaq! Onlar bütün ömürləri boyu yalnız bu arzu ilə yaşamış və ideallarına son nəfəslərinədək sadiq qalmışlar. Məhz elə buna görədir ki, Birinci Türkoloji Qurultayın qazax millətindən olan nümayəndələri Əhməd Baytursunov, Bilal Suleyev, Eldes Omarov, Əziz Bayseyidov və Nazir Torekulovun adı bu gün qazax xalqının yaddaşına həkk olunmuş, görkəmli maarifçi və eyni zamanda vətənpərvər mütəfəkkirlər türk dünyasının fəxri vətəndaşları zirvəsinə ucalmışlar.

***Rəyçi: prof. N.Cəfərov***

## İstifadə edilmiş ədəbiyyat

1. Первый Всесоюзный Тюркологический Съезд (Стенографический отчет). Баку: Нагыл Эви, 2011.

2. Birinci Türkoloji Qurultayın 80 illik yubileyi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı. Bakı şəhəri, 9 noyabr 2005-ci il // "Azərbaycan" qəzeti, 2005, 10 noyabr.

3. Birinci Türkoloji Qurultayın 90 illik yubileyinin keçirilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı. Bakı şəhəri, 16 fevral 2016-cı il // "Azərbaycan" qəzeti, 2016, 17 fevral.

4. Şükürov A. "Böyük Çöl Birinci Beynəlxalq Humanitar Elmlər Forumu (Azərbaycan elmi tədbirdə uğurla təmsil olunub)" // "Elm" qəzeti, № 10, 27 may 2016.

5. Кононов А. Современное тюркское языкознание в ССР. Итоги и проблемы. Москва: "Наука", "Вопросы языкознания", № 3, 1977.

6. https://az.wikipedia.org/wiki/Əhməd_Baytursunov

7. https://ru.wikipedia.org/wiki/Байтурсынов,_Ахмет

8. http://www.zhensovet.kz/content/fatima-gabitova

**А.Шукюров**

**На первом тюркологическом сьезде представители из Казахыстана**

**Резюме**

В статье обстоятельно говорится о целях и задачах съезда и ряде вопросов, обсуждаемых на нём. Приводятся биографические сведения о первых казахских участниках конгресса, подвергшихся впоследствии репрессиям. В статье говорится также о связях тюркоязычных народов, в частности неразрывных азербайджанско-казахских литературных связях.

**A.Shukurov**

**The representatives of Kazakhstan in the first turkic congress**

**Summary**

In the article is dealt with the aim and intention of the First Turkish Congress held in Baku and some issues discussed here. It is given autobiographical information about the Kazakh representatives participated in the congress and then exposed to repression. In the article is expressed that the literary relations of Turkish speaking nations as well as Azerbaijan-Khazakh are connected with unbreakable wires.



# TÜRK DÜNYASININ PARLAQ ULDUZU

**Nəcəf Nəcəfov,**
***Azərbaycan Yazıçılar Birliyinin üzvü,***
***filologiya üzrə fəlsəfə doktoru, dosent, əməkdar müəllim***

**"Oljas, sən təkcə qazaxlara yox, bütün türklərə lazımsan".**
***Heydər Əliyev***

Məqalədə dünya söhrətli şair, yazıçı-ədəbiyyatşünas, Qazaxıstanın ictimai-siyasi xadimi, səfir Oljas Süleymenovun həyatı, yaradıcılığı və ictimai-siyasi fəaliyyətindən bəhs edilir. Məqalədə Heydər Əliyev və Oljas Süleymenov münasibətlərinə xüsusi yer verilmişdir.

***Açar sözlər:*** *türk dünyası, ödül, epoxa, həyat qrafiki, qloballaşma.*
***Ключевые слова:*** *тюркский мир, орден, эпоха, жизненный график, глобализация.*
***Key words:*** *turkish world, awards, epoch, schedule of life, globalization.*

190 il bundan əvvəl, Sankt-Peterburqda dekabristlər üsyanı amansızcasına yatırıldıqdan sonra böyük rus şairi A.S.Puşkin senata çağırılır və ondan soruşulur ki, 1925-ci il dekabrın 25-də Sankt-Peterburqda olsaydın nə edərdin? Puşkin heç düşünmədən:"Senat meydanında olardım",- cavabını vermişdi. O dövr üçün çox cəsarətli sayılan bu cavab Puşkinin dekabristlərlə həmrəy olduğunun aydın ifadəsi idi.

İndiki halda 80 yaşına qədəm qoyan Oljas Süleymenovdan soruşulsa ki, 90 il bundan əvvəl 1926-cı ildə Bakıda olsaydın nə edərdin? Yəqin ki, onun cavabı belə olardı: "I Türkoloji Qurultayda çıxış edib bütün türk dünyasını həmrəyliyə çağırardım".

Oljas Süleymenovun türk dünyasındakı bugünkü mövqeyi buna əsas verir. Onun xidmətlərinin müxtəlif səviyyələrdə dəyərləndirilməsi də fikrimizi təsdiq edir.

Böyük şair, ədəbiyyatşünas türkologiya sahəsindəki yaradıcılıq uğurlarına görə, Qazaxıstanda 2002-ci ildə KülTegin mükafatına, "Otan" ordeninə, Ukraynanın yüksək dövlət mükafatlarından "V dərəcəli knyaz Müdrik Yaroslav" ("Yaroslav Mudrı"), 2006-cı ildə Azərbaycanın "Şöhrət", 2011-ci ildə isə "Dostluq", həmçinin İnquşetiya "Xidmətlərinə görə" ordeninə (2004), Türkiyə Cümhuriyyətinin "Türk dünyasına qatqılarına görə" uluslararası ödülünə layiq görülmüşdür. O, Dialoq Avrasiya Platformasının yaradıcılarından və fəal iştirakçılarındandır, Qazaxıstanın Dövlət ödülü laureatıdır. O.Süleymenov UNESKO-da Qazaxıstanın səlahiyyətli nümayəndəsidir.

Oljas Ömər oğlu Süleymenov 1936-cı il mayın 18-də Almatı şəhərində anadan olmuşdur. O, 1954-1959-cu illərdə Qazaxıstan Dövlət Universitetinin geologiya fakültəsində, 1961-1962-ci illərdə M.Qorki adına Ədəbiyyat İnstitutunda təhsil almışdır. Təhsilini başa vurduqdan sonra o, 1962-ci ildə Qazaxıstan Dövlət Universitetinin aspiranturasına daxil olmuş, elə həmin il

Yazıçılar İttifaqının üzvlüyünə qəbul edilmişdir. 1962-1971-ci illərdə "Kazaxskaya pravda" qəzetində ədəbiyyat məsələləri üzrə işçi və "Qazaxfilm" kinostudiyasında baş redaktor, "Prostor" jurnalında jurnalistika şöbəsinin müdiri vəzifələrində çalışmışdır.

Ədəbi yaradıcılığa hələ universitet illərində başlamış gənc Oljasın ilk şeiri 1959-cu ildə işıq üzü görmüşdü. Sonrakı illərdə onun "Torpaq, insana təzim et!" poeması (1961), "Yel qanadlı atlar" (1961), "Nurlu gecələr" (1962), "Gündoğana" (1964), "Gil kitabə" (1969) və başqa şeir kitabları nəşr olunmuşdur. Kinostudiyada işlədiyi illərdə "Atalar yurdu" (1966), "Göy marşrut" (1968), "Qış çöl sezonu deyil" (1972), "Reketçi" (2007), "Mahambet" (2008), "Cangir" (2011) və s. filmlərin ssenarisini yazmış, istedadlı kinoşünas kimi tanınmışdır.

O.Süleymenovun "Köçərilər və Rusiya" adlı ilk məqalələri tarix və etimologiyaya həsr olunmuşdur. "Yazı dili" (1998) və "Tanrının gülümsəməsi" (1998) əsərləri isə Romanın San Paolo nəşriyyatlarında çapdan çıxmışdır.

Az müddətdə Qazaxıstan ədəbi ictimaiyyəti arasında böyük nüfuz qazanan O.Süleymenov 1971-1981-ci illərdə Qazaxıstan Yazıçılar İttifaqının katibi, 1981-1983-cü illərdə Qazaxıstan Kinematoqrafçılar İttifaqı İdarə heyətinin birinci katibi, 1983-cü ildə isə Yazıçılar İttifaqının birinci katibi seçilmişdir. Qorbaçovun "yenidənqurması" iflasa uğrayandan sonra, 1989-cu ildə o, milli azadlıq hərəkatının alovlanmağa başladığı zaman öz ölkəsində "Nevada Semipalatinsk nüvə əleyhinə hərəkat"ın və Qazaxıstan Xalq Konqres Partiyasının əsasını qoymuşdur. 1990-cı ildə Türk Xalqları Konqresinin keçirilməsində onun müstəsna xidmətləri olmuş və həmin il Qazaxıstanın Xalq yazıçısı fəxri adını almışdır. 1991-ci ilə qədər bir neçə çağırış Qazaxıstan və SSRİ Ali Sovetinə deputatı seçilmişdir.

Qazaxıstanın dünya şöhrətli şairi, böyük mütəfəkkir ziyalısı Oljas Süleymenov beynəlxalq miqyasda qəbul olunmuş ictimai xadim, türk dünyasının müasir epoxadakı görkəmli nümayəndəsi kimi şərəfli bir ad qazanmışdır.

Oljasın həyat yolu bizim 60-cı illər yazıçılarımızın keçdiyi yollardan o qədər də fərqlənmir, bəlkə də bir-birinə bənzəri daha çoxdur. Məlumdur ki, 60-cı illərdə bütün dünya üzrə ədəbi prosesdə bir canlanma hiss olunurdu. Ədəbiyyat aləmində qələmini sınayan Oljas da bu böyük hərəkata qoşularaq öz şeirləri ilə doğma vətənində azadlıq carçısı səviyyəsinə yüksəlmişdi. Cambul Cabayevin xalq ruhunda yazılmış şeirləri ilə nəfəs alan qazax xalqı Oljasın şeirlərində yeni ruh, yeni nəfəslə qarşılaşdı.

Öz yaradıcılıq manerası, dünya hadisələri ilə səsləşən, cəsarətli fikirləri ilə meydana atılan gənc Oljas ictimai-siyasi həyatda bacarıqlı liderlərdən birinə çevrildi. O, 1975-ci ildə tamamilə yeni bir mövzuda yazılan "Az Ya" əsəri ilə SSRİ miqyasında, necə deyərlər, ulduz kimi parladı. Oljas biləbilə bu əsərini rus dilində qələmə almışdı. Bu əsərində o, elmi-tarixi əsaslandırma yolu ilə türk xalqlarının tarixi və mədəniyyətinin qədimliyi və türk mədəniyyətinin şumer mədəniyyətinin varisi olduğunu sübuta yetirmişdi. Bundan ötrü onun başı ağrısa da qazaxların yeni nəslinin nümayəndəsi olan bu gənc alim SSRİ miqyasında öz mövqeyini ortaya qoydu. Əsər böyük mübahisələrə səbəb oldu.

Qeyd etmək lazımdır ki, Moskvada

ən məsul yerlərdə “Az Ya”nın müzakirələri keçirildi. Bu gərgin anlarda Oljas öz mövqeyini cəsarətlə müdafiə edə bildisə də, rejim öz bildiyini etdi. Qazaxıstan KR MK-nın 17 iyul 1976-cı il tarixli qərarı ilə siyasi xarakterli olduğuna görə kitab satışdan yığışdırıldı. Lakin az vaxt içərisində türk dünyası bu yeniliklərdən xəbər tutmuşdu, obrazlı desək, “Az Ya” öz işini görmüşdü.

Yazıçı bu əsərində türk xalqlarının tarixinə, dilinə, ictimai-siyasi nüfuzuna böyük həssaslıqla, elmi dərinliklə yanaşmışdı. Bir tarixçi, etnoqraf kimi dərin biliyə malik olması, demək olar ki, kitabın hər bir sətrində hiss olunur. Coşqun şair təbli filosof-etnoqrafın bu qələm təcrübəsi elm aləmində maraqla qarşılandı. Onun bu sahədəki axtarışlarının sədası Azərbaycana da çatmışdı. Azərbaycan oxucusu bu əsərlə onu müdrik bir mütəfəkkir, tarixçi-etnoqraf kimi də tanıdı. O. Süleymenov haqqında Azərbaycanda dəyərli yazılar işıq üzü görmüşdü. Bunlardan ən mükəmməli professor E.Quliyevin araşdırmalarıdır. Təcrübəli alim “Türk xalqları ədəbiyyatı” kitabında Oljasın yaradıcılığını böyük ustalıqla təhlil etmişdir. Ali məktəblər üçün bu sanballı dərslikdə “Az Ya” haqqında deyilənlər və ümumiyyətlə, O.Süleymenovun yaradıcılığı, şeirlərindəki sətraltı mənalar tədqiqat obyektinə çevrilmişdir. Onun “Türk xalqları ədəbiyyatı”nda oxuyurduq: “Az Ya” O.Süleymenov yaradıcılığında əsas yer tutur. Əsər türk etnik-kulturoloji, etnogenezis məsələlərinin öyrənil-məsində, tarixi araşdırmalar nəticəsində türklərin geniş mənada “həyat qrafikinin” tədqiqində əhəmiyyətinə görə seçilir. Müəllif rus dilində yazmış olduğu bu əsərinə maraqlı və orijinal bir ad seçmişdir. “Az Ya” öz adının orijinallığı baxımından deyil, mahiyyət dərinliyinə, qoyulan problemlərin elmi-analitik şərhi baxımından da fərqlənir. “Az” əski slavyancada “mən”, “Ya” isə müasir rus dilində “mən” deməkdir. Yəni “mən və mən”. Eyni zamanda “Az” kiril əlifbasının ilk, “ya” isə son hərfidir. Lakin burada məna formal “sən və mən” şərtiliyində açıqlanır. Və bu şərtilik daxilində rus ədəbiyyatı (Az) və türk xalqlarının (Ya) tarixi, mədəniyyəti, etnik kimliyi barədə müfəssəl məlumatlar verilir, müqayisəli təhlil aparılır. Bu müqayisədə elmi-tarixi əsaslandırma yolu ilə türk xalqlarının tarix və mədəniyyətinin qədimliyi, üstünlüyü, təsir gücü üzə çıxır. Müəllif türk mədəniyyətinin Şumer mədəniyyətinin varisi olduğunu sübuta yetirir”.

“İqor polku haqqında dastan”da dil, üslub, tarix və ideoloji baxımdan türk təsirinin olması faktlar əsasında təsdiqini tapır. O.Süleymenov “İqor polku haqqında dastan”ı türk xalqları üçün də nadir abidə hesab edir. Daha sonra kitabda deyilir:

“Az Ya” yazıldığı illərdə qədim türk mədəniyyətinin iki inkişaf zirvəsi olan türk-Şumer və türk-Sibir mərhələlərinin neçə minillik tarixini izləmək, onların dünya mədəniyyətində, dünya sivilizasiyasında rolunu müəyyənləşdirmək, türklərin haqsız qeyri-elmi-tarixi hücumlara məruz qalmaq və s. məsələlərə toxunulsa da, bu sahədə biliklər hələ yetərli deyildi. Lakin “Az Ya”da bunlar obyektiv və haqlı təhlil və tədqiq nəticəsində ortaya yeni çalarlar qoydu. O, əsərdə türkizm məsələsinə xüsusi diqqət yetirir, türkizmlərin olmasını “İqor polku

haqqında dastan"da XII əsr slavyan dialekti əsasında sübut edilən əsas dəlil kimi qiymətləndirilir. Əsərdə özünə yer tapan türkçülük ideyaları o vaxtkı ideoloji tələblərə uyğun olmadığı üçün rəsmi şəkildə müəllifə qarşı ittihamların irəli sürülməsinə gətirib çıxarmışdır".

"Oljasın poetik təfəkkürü çox qədim mənbələrdən gəlir, - XI-XII əsrlərdən etibarən türk poeziyasında: həm Mərkəzi Asiya, həm Ural-Volqaboyu, həm də Qaraçay-Kiçik Asiya regionlarında eyni vaxtda İran motivləri, metaforaları, intonasiyası və s. qüvvətləndi, türk şeiri sərbəstliyini, nəfəs genişliyini itirdi və poetik özünüifadə əruz standartlarına tabe oldu" (N.Cəfərov).

Qazaxıstanın böyük oğlu ömrünün böyük bir hissəsini "Min bir söz" ("Тысяча и одно") adlı etimoloji lüğətin tərtibinə həsr etmişdir. Bu kitab rus və qazax dillərində çap olunmuşdur. Kitab türk dillərinə dair ən tutarlı mənbədir.

Şərq xalqları içərisində yetişən və dünyanın görkəmli şəxsiyyətləri səviyyəsinə yüksələn Oljas Süleymenov öz ölkəsinin vətənpərvəri kimi ictimai-siyasi hadisələrdə həmişə fərqlənmişdir. O xüsusən, Azərbaycana və onun rəhbəri ulu öndər H.Əliyevə böyük hörmətlə yanaşmışdır. Ümummilli lider Heydər Əliyevin Moskva müxbirinə verdiyi cavabdan götürülmüş sözlər də bunu təsdiq edir:

Qeyd etmək lazımdır ki, O.Süleymenov Siyasi Büro üzvləri H.Əliyev və D.Kunayevə eyni münasibət bəsləmişdir. O, H.Əliyevin istefası və haqsız təqiblərə məruz qalması ilə D.Kunayevin Qazaxıstan rəhbərliyindən kənarlaşdırılması tarixçəsində bir oxşarlıq da görürdü. Ancaq H.Əliyevdən fərqli olaraq qazax liderinin yanında, H.Əliyevin dediyi kimi, həmin məqamda karyerasından qorxmayan bir şəxsiyyət vardı. O, Oljas idi. Bu maraqlı və ibrətamiz əhvalatı Oljasın öz dilindən eşitməyi daha məqsədəuyğun sayırıq. Elmira Axundovanın "Şəxsiyyət və zaman" kitabında oxuyuruq:

"- Bu hadisə Heydər Əliyev hakimiyyətə qayıdandan sonra birinci görüşdə olmuşdur. O yazır:

- Bu, o vaxt, Nizaminin yubileyində "Oljas, sən təkcə qazaxlara yox, bütün türklərə lazımsan" deyən elə həmin Əliyev idi. O dəyişməmiş, daha da mehriban olmuşdu. Biz qucaqlaşdıq, yaxşıca söhbət etdik. Və mənim yadıma onun istefadan sonra dediyi sözlər düşdü. Hələ o vaxt gəlib bizə çatmışdı: "Mənim Kunayev kimi öz Oljasım olmadı". O vaxt həqiqətən mən Kunayevin arxasında durdum".

- Ölkə həmin dramatik əhvalatı belə xatırlayır:

- 1986-cı il dekabrın 16-da Qazaxıstan KP MK-nın plenumu oldu. Moskvadan Kolbini göndərdilər, onu seçdilər və bu, qəzəb dalğası doğurdu, əsl gənclər qiyamına səbəb oldu. Kunayevi çıxarıb təqaüdə göndərdilər. Halbuki, yanvarın 12-ni, 75 yaşının tamam olmasını gözləmək, bir orden də verib, onu ləyaqətlə yola salmaq əvəzinə isə yerlilərdən kimisə seçmək olardı. Yox, tələsdilər, ordenə heyifləri gəldi.

Sonra onu da, məni də təqib etməyə başladılar. Hesab edirdilər ki, iğtişaşları biz hazırlamışıq. Yadımdadır, bizim "Kazaxstanskaya pravda"da yazmışdılar: "Nə vaxta kimi Süleymenov Mərkəzi Komitəni oynadacaq?". Onda Kunayev mənə dedi:

- Oljas, çıx get Moskvaya. Bu, son xəbərdarlıqdır. Onlar ictimai rəy hazırlayır-

lar, bundan sonra səni həbs edəcəklər.

Mən Moskvaya getdim, Yulian Semyonovun evində yaşadım. Mən orda sadəcə gizlənməmişdim, mən orda iş görürdüm. Yulian Semyonovun yuxarılarda yaxşı əlaqələri var idi. SSRİ DTK-sında Filip Bobkov işləyirdi, çox ağıllı adam idi. Sov. İKP MK-da - Aleksandr Nikolayeviç Yakovlev. Biz Kunayevi müdafiə edə bildik. Axı o vaxt onu Rəşidovun gününə salmaq, bütün mükafatlarını əlindən almaq, ölkədə biabır etmək, cinayət işi qaldırmaq, büstünü götürmək istəyirdilər. Yulianla biz hər qarış mövqeyi müdafiə edirdik. O vaxt mən kimisə hədələdim:

- Siz şübhələnirsiniz, ancaq hələ əmin deyilsiniz ki, dekabr üsyanını Süleymenov qaldırmışdı, yoxsa yox. Bax, əgər büstü götürsələr, arxayın ola bilərsiniz ki, mən bunu edəcəyəm.

Büst yerində qaldı, elə indi də Almatıda, Kunayev bağçasındadır. Qısası, nə büstə, nə də onun özünə toxundular. Ancaq evində axtarışlar aparmışdılar. 1987-ci ilin iyulunda Sov. İKP Mk-nın Plenumunda Kunayevi Siyasi Büronun tərkibindən çıxarırdılar. İdeologiya üzrə katibimiz çıxış edib dedi ki, dekabrın 17-də səhər saat dörddə Oljas Süleymenov Kunayevə zəng vurub demişdi: “Cavanlar hazırdır, biz çıxırıq”.

Siyasi Büronun iclasından sonra Almatı aeroportunda Kunayevi qarşıladım. O, mənə bu fitnəkar çıxış barədə danışdı.

Mən dərhal Moskvaya, SSRİ Ali Sovetinin sessiyasına uçdum. Plenumdan sonra, adətən, həmin o Georgi zalında sessiya keçirilirdi. Sessiyaya qalmış bizim vilayət partiya komitələrinin birinci katiblərindən biri həmin adamın çıxışını təfərrüatı ilə danışdı. O da sessiyaya görə qalmışdı. Baxdım ki, bizə tərəf gəlir. Məni görüb qucaqladı. Geri çəkilib dedim:

-Georgi zalında mən, əlbəttə ki, sənin cavabını lazım olan kimi verə bilmirəm, özümə rəva bildiyim yalnız bir şey qalır, - sənə əl uzatmamaq.

Bir müddət sonra Yulian Semyonov Almatıya zəng vurdu, mən onunla artıq danışmışdım ki, gizli mənzilə zəng vursun, çünki telefonum dinlənilirdi. O, gizlətmədən dedi:

- Dimaş Axmetiça de ki, (Biz onu belə çağırırdıq, əsl adı Dinmühəmməd Əhmədoviç idi) bütün ittihamlar götürülüb.

Bu, artıq 1988-ci il idi.

Mən dedim:

-Yulian, sənin yadından çıxıb, onun adını açıq çəkirsən?

O isə dəstəyə çığırdı:

- Qoy bütün bu alçaqlar, əclaflar eşitsinlər. Eşidirsiniz məni?

Kunayevə daha toxunmaq olmaz!”

Mənim plenumdakı çıxışımdan sonra qərar çıxarıldı ki, Süleymenovun məsələsinə baxılsın, onun işi Partiya Nəzarəti Komitəsinə göndərilsin”.

Bir sözlə, bütün Qazaxıstan, türk aləmi bildi ki, Süleymenov Kunayevin yanından çəkilmədi. Əliyev də bunu bilirdi. Ona görə də Heydər Əliyevi Siyasi Bürodan çıxaranda o, yaxınlarından kiməsə demişdi: “Mənim Kunayev kimi öz Oljasım olmadı”. Bu da həmişə mümkün olmazdı. Səbəb o idi ki, Oljası artıq bütün dünya tanıyırdı. Həm də yaxşı tanıyırdı.

O.Süleymenov Azərbaycan xalqının ən ağır günlərində onun yanında olmuşdur. 1990-cı il 20 yanvarda Azərbaycan xalqının başına açılan müsibətlərə bütün dünya göz yumduğu vaxtda, Oljas elə həmin günlərdə Bakıya uçmuş və bizimlə həmrəy olduğunu bildirmişdir. O 20 yanvar hadisələrində özünü hər yerdə Azərbaycan xalqının oğlu kimi aparırdı.

Ermənistanda zəlzələ olan günlərdə

Azərbaycandan köməyə göndərilən 70 gəncin təyyarəsi ermənilərin xəyanəti nəticəsində elə havadaca partladılmışdır. Onlar Ə.Vəzirovun qardaş köməyinə göndərdiyi gəncləri havada yandırdılar. Bu faciəyə də reaksiya verən tapılmadı. Adi baş sağlıqları da verilmədi. Ə.Vəzirovun seçib göndərdiyi gənclər hər yerdə, hətta bizim ölkədə də unuduldu. Ancaq bu faciəvi hadisəni bir şəxsiyyət yada saldı. Bu, Oljas idi. O SSRİ xalqları deputatlarının yüksək tribunasından Ermənistana köməyə gedən gənclərin təyyarəsinin göydə partladılmasını xatırlatdı və çox lirik tonlarla , "onların ölümünü analarından başqa hamı unutdu", – dedi. İlk dəfə məhz Oljas məsələ qaldırdı ki, onlara abidə qoyulmalıdır, o gənclərin fədakarlığına layiqli qiymət verilməmişdir. Bəli, Oljas bu cəsarətin, bu qeyrətin sahibidir.

Əlamətdar bir hadisədir ki, ədəbi ictimai fəaliyyətində Azərbaycan həqiqətlərinin təbliği işində böyük xidmətlərinə görə Oljas Süleymenov "Azərbaycan Respublikası Prezidentinin fəxri diplomu" ilə təltif edilmişdir.

Təsadüfi deyildir ki, 2013-cü ildə Nyu-York universitetinin saytında Qərb aləmində məşhur müəlliflər kimi tanınan Petr Dutkiyeviç və Riçard Sakva tərəfindən müəyyənləşdirilən 22 görkəmli mütəfəkkirin sırasında Qazaxıstanın ictimai xadim və şairi Oljas Süleymenovun da adı vardır. Bu qərara görə, 19 ingilis siyasətçisi, iqtisadçısı və ictimai xadiminin seçimi ilə dünyanın idarə olunmasında bu 22 nəfərin fikirlərinə ehtiyac olduğu qət olunmuşdur.

Bu müsabiqədə Oljas Süleymenov Şanxay Universitetinin prezidenti ilə birlikdə multikulturalizmin qloballaşan dünya səviyyəsinə qaldırılmasını təklif etmişlər. Onların fikrincə, müstəmləkəçilik öz dövrünü başa vurmuşdur. İndi dünyanın 200 ölkəsi siyasət aləminə öz töhfəsini vermək əzmindədir.

Azərbaycanda 2016-cı ilin multikulturalizm ili elan olunması da onun fikirlərinin nə qədər aktual olmasına diqqəti cəlb edir.

O.Süleymenovun dünya miqyaslı siyasətçi, alim, mütəfəkkir olmasına münasibət bildirən Azərbaycan MEA-nın müxbir üzvü, professor N.Cəfərov "Türk dünyası: xaos və kosmos" əsərində yazır: "Oljas Süleymenov dünyanın bizə məlum olan, bəlkə də yeganə şairidir ki, təfəkkürü eyni zamanda həm zəngin etnoqrafik potensiala, həm də müasir poetik "diplomatiya"ya malikdir – naturalizmlə analitizmin bu cür üzvi vəhdətini verən ikinci bir şairi təsəvvürə gətirmək qeyri-mümkündür".

O.Süleymenov Azərbaycan mövzusuna həmişə həssaslıqla yanaşmışdır. "Xəzər Albaniyası", "İpək yolları" tarixi-linqvistik novellalarında o, elmi faktlara əsaslanaraq qədim ipək yolunun tarixini araşdırarkən bu qənaətə gəlmişdir ki, Azərbaycan xalqı bu yolun inkişafında önəmli rol oynamışdır, azərbaycanlılar irsən ticarət yollarına rəvac verən xalqdır, bir qədər də müasir dildə desək, "irsən gömrükçüdürlər". O yazırdı: "İpək yolunun əsas qollarından biri İrandan keçərək Yaxın Şərqədək uzanırdı. Xəzər dənizinin qərb sahili boyunca Dəmir Qapılardan (Dərbənd) keçən marşrut xüsusilə dəbdə idi".

Onun türklər haqqında dediyi aşağıdakı sözlər də maraqlı və əhəmiyyətlidir: "Türklər tarix sahəsində müxtəlif adlarla – çox vaxt tayfa adları ilə (oğuz, qıpçaq, bulqar və s.) tanınırlar. Qədim keçmişdə türk dilli tayfaların heç də hamısı özünü türk hesab etmirdi. Yeri gəlmişkən, elə bu gün də onlarla türk dilli xalqlardan yalnız oğuzlar (türklər, azərbaycanlılar və türkmənlər) bu ümumi adı özlərinə şamil edirlər. Ancaq bulqar-qıpçaqlar, karluklar və b. yalnız elmi

ədəbiyyatdan bu superetnosa aidiyyəti olduğunu bilmişlər.

Azərbaycan öz dostunu, düşmənini yaxşı tanıyır. Oljas da bizim mətinli dostlarımızdandır. AMEA Elmi Şurasının 25 aprel 2016-cı il tarixli qərarı ilə xalqlar arasındakı dostluğun möhkəmləndirilməsində əvəzsiz xidmətlərinə görə, Oljas Süleymenov Nizami adına Ədəbiyyat İnstitutunun Fəxri doktoru adına layiq görülmüşdür. Bu yığıncaqda Azərbaycan alimləri onun haqqında ürək sözlərini bildirmişlər.

AMEA-nın vitse-prezidenti Nizami adına Ədəbiyyat İnstitutunun direktoru, akademik İsa Həbibbəyli qeyd etmişdir ki, görkəmli qazax yazıçısı O.Süleymenovun 80 illik yubileyinin qeyd edilməsinə əlamətdar hadisə kimi baxılmalıdır. Azərbaycan xalqı ədibin elmi və ədəbi yaradıcılığına yaxşı bələddir. Görkəmli yazıçının əsərləri Azərbaycanda da sevilə-sevilə oxunur. Akademik İ.Həbibbəyli O.Süleymenovun əsərlərinin Azərbaycan dilində dəfələrlə böyük tirajla çap olunduğunu da qeyd etdi və həm də yazıçının “Az Ya” kitabının Azərbaycan Prezidenti İlham Əliyevin “Latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında” sərəncamına əsasən 2007-ci ildə 25 min tirajla çap edilərək geniş ictimaiyyətə və oxuculara çatdırıldığını da xatırlatdı. Vaxtilə ulu öndər Heydər Əliyevin yüksək dəyərləndirdiyi görkəmli yazıçının xidmətləri Azərbaycan Prezidenti İlham Əliyev tərəfindən də həmişə qiymətləndirilmişdir. Bu tədbirdə də qardaş Qazaxıstanın dünya şöhrətli ziyalısı O.Süleymenov beynəlxalq miqyasda, dünya masştabında qəbul olunmuş ictimai xadim və qədim tarixi ənənələrə malik olan türk dünyasının müasir epoxadakı görkəmli nümayəndəsi olduğu da qeyd olundu. Akademik İ.Həbibbəyli onu da vurğuladı ki, O.Süleymenovun Qazax ədəbiyyatının və ictimai fikrinin qiymətli nümunələri olan əsərləri dünya ədəbiyyatını, türk xalqlarının ədəbiyyatını zənginləşdirir.

Oljas Süleymenov əvvəlki enerjisi ilə yenə də yazıb, yaradır. Türk xalqlarını birliyə səsləyir. Azərbaycan xalqı onu öz oğlu kimi sevir və ona uğurlar arzu edir.

***Rəyçi: prof. E.Quliyev***

## İstifadə edilmiş ədəbiyyat

1.Axundova E. Heydər Əliyev. Şəxsiyyət və zaman. Bakı: Ozan, 2009.

2. Süleymenov O. “Az Ya”. Bakı: Şərq-Qərb, 2007.

3. Süleymenov O. İpək yolları.// Dirçəliş. XXI əsr.

4. Quliyev E. Türk xalqları ədəbiyyatı. Bakı, 2014.

5. Süleymenov O. Kuman nəğməsi (məqalələr, şeir və poemalar). Bakı, 2011.

6. Фейзуллаева А. Олжас Сулейменов: опыт спектрального исследования творческой деятельности. Баку: Шарг-Гарб, 2009.

**Н.Наджафов**

**Яркая звезда Тюркского мира**

**Резюме**

В статье говорится о жизни, творчестве общественно-политической деятельности всемирно известного поэта, писателя-литературоведа, общественно-политического деятеля Казахыстана, дипломата Олжаса Сулейменова.

**N.Najafov**

**The shining star of Turkish world**

**Summary**

The article is dedicated to the worldwide poet, writer, literary critic, ambassador and public figure of Kazakhstan Oljas Suleymanov’s life, literary, social and political activity. In the article special attention is given to the relationship between Haydar Aliyev and Oljas Suleymanov.



# KOMPÜTER TEXNOLOGİYALARININ TƏTBİQİNƏ DAİR



**İlham Əhmədov,**
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

**Nigar Məmmədova,**
***Bakı şəhəri, "British School" məktəbinin müəllimi***

***Açar sözlər:*** *ali təhsil, təhsilin informatlaşması, informasiya texnologiyaları, elektron resurslar, tətbiqi proqram paketləri, intellektual texnologiyalar.*

***Ключевые слова:*** *высшее образование, информатизация образования, информационные технологии, электронные ресурсы, прикладные программные пакеты, интеллектуальные технологии.*

***Key words:*** *higher education, informatization of education, information technology, electronic resources, application software packages, smart technologies.*

Təhsilin informatlaşması bütün ölkələr üçün prioritetdir. Müasir təhsil sisteminin əsas aləti informasiya texnologiyalarıdır (İT). İT-nin yaradılması, inkişafı və istifadə strategiyası ölkənin strateji planının mühüm komponentidir. Bununla belə inkişafın müasir səviyyəsində dəyişikliklərin, innovasiyaların istiqaməti və intensivliyi hesablama texnikası, telekommunikasiya, proqram vasitələrinin imkanları ilə deyil, bu vasitələrdən istifadə edən insanların peşəkarlıq səviyyəsi, yeniliklərə, innovasiyalara, davamlı dəyişikliklərə hazırlığı ilə müəyyən edilir. Ölkənin səmərəli informatlaşması təhsilin informatlaşmasından başlayır, bu səbəbdən təhsilin informatlaşması bütün ölkələr üçün prioritet məsələdir. Təhsil sferasında informatlaşma prosesi 2 "müstəvi"də həyata keçirilir:

1. İdarə edilməyən informatlaşma. Bu istiqamət tabelikdə işləyənlərin təşəbbüsü ilə həyata keçirilir. Bu zaman innovativ düşüncəli pedaqoji kadrların təşəbbüsü ilə tədris prosesinin müəyyən hissəsi, ayrı-ayrı mərhələlər qismən informatlaşır. Lakin bu, sistemli və qənaətbəxş sayıla bilməz, çünki təhsilin informatlaşması kimi mürəkkəb proses dəqiq layihələnməli və ciddi resurslarla təmin edilməli, geniş əhatə dairəsinə malik olmalıdır.

2. İdarə edilən informatlaşma. Bu istiqamət rəhbər orqanların təşəbbüsü ilə müəy-yən konsepsiya və proqramlar əsasında həyata keçirilir, tədris prosesi maddi və qeyri-maddi resurslarla təmin edilir. Bu proses ölkənin təhsil strategiyası və müvafiq dövlət proqramları ilə əlaqəli şəkildə həyata keçirilməlidir.

Ənənəvi təhsil texnologiyalarından fərqli olaraq, İT-nin predmeti və prosesin (əməyin) son nəticəsi informasiyadır, əmək aləti isə kompüterdir. Bu səbəbdən yaradılmış informasiya məhsullarının keyfiyyəti və istifadə səmərəsi tətbiq edilən aparat və proqram vasitələrinin keyfiyyətindən asılıdır. Bir çox ölkələrdə təhsil sisteminin informatlaşması konsepsiyası mövcuddur. Bu konsepsiyalarda qeyd edilir ki, təhsilin informatlaşmasının strateji məqsədi İT-dən istifadə əsasında intellektual fəaliyyətin qlobal rasionallaşması, postindustrial cəmiyyətin tələblərinə uyğun olaraq yeni tip

təfəkkürə malik mütəxəssislərin hazırlanması, bu proseslərin keyfiyyət və səmərəsinin yüksəldilməsidir. Bu prosesin nəticəsində cəmiyyətdə kütləvi kompüter savadlılığına nail olmaq, təhsilin fərdiləşməsi hesabına informasiya mədəniyyəti formalaşdırmaq mümkündür. Təhsilin informatlaşmasının bu məqsədləri mahiyyətcə uzunmüddətli dövrü əhatə edir, bu səbəbdən XXI əsrdə də öz aktuallığını saxlayacaq.

Təhsil sferasının informatlaşmasının strateji məqsədi çoxaspektli olub, bir sıra hədəfləri müəyyən edir:

1. Tələbələri informasiya cəmiyyəti şəraitində yaşamağa, ictimai və peşə fəaliyyətində səmərəli iştiraka hazırlamaq;
2. Təhsilin keyfiyyətini yüksəltmək;
3. Təhsilin əlyetərliyini yüksəltmək;
4. Əhalinin təhsil səviyyəsinin, insan kapitalı keyfiyyətinin yüksəldilməsi hesabına ölkənin iqtisadi potensialının artımına nail olmaq;
5. Milli təhsil sistemini qlobal elm, iqtisadiyyat, ictimai-siyasi və mədəni infrastruktura inteqrasiya etmək.

Ali təhsil sisteminin informatlaşmasının əsas istiqamətlərini aşağıdakı kimi qruplaşdırmaq olar:

1. Təlim proseslərinin avtomatlaşdırılması;
2. Dövlət təhsil standartları ilə müəyyən edilmiş ümumi və peşə “informasiya mədəniyyəti”nin formalaşması üçün tələbələrin zəruri bilik, bacarıq və vərdişlərə yiyələnməsi;
3. Təhsil sferasının informasiya infrastrukturunun yaradılması;
4. Təhsilin idarə edilməsi proseslərinin informatlaşması;
5. Milli təhsil sistemində həyata keçirilən elmi tədqiqatların informatlaşması;
6. Təhsil sferasının müasir informasiya-hesablama vasitələri və telekommunikasiya sistemi ilə təminatı;
7. Müasir distant təhsil sisteminin yaradılması və inkişafı.

Təhsil paradiqmasının mühüm komponentləri həmişə diqqət mərkəzində saxlanmalıdır. Cəmiyyətin, bəşəriyyətin inkişafında baş verən qlobal dəyişiklik təhsil sektorunun real vəziyyətinə ciddi təsir göstərir, yeni təhsil paradiqması formalaşır. İnformatlaşma kontekstində yeni təhsil paradiqmasının mühüm komponentləri aşağıdakılardır:

1. Təhsil prosesinin informatlaşma konsepsiyası.
2. Təlimin yeni texnologiyalarının hazırlanması və tədris prosesində tətbiqi.
3. İnformasiya-təhsil məkanı (İTM) şəraitində mütəxəssisin yeni-innovativ fəaliyyət modelinin konseptual əsaslarının hazırlanması.
4. Mütəxəssislərin peşəkarlığının yüksəldilməsinin psixoloji-pedaqoji qanunauyğunluqlarının elmi təhlili, təcrübədə ondan geniş istifadə.

İT-nin tətbiqi ilə əlaqədar hər hansı bir proses aşağıdakı 3 mühüm məsələnin həllini tələb edir:

1. Yeni aparat vasitələrinin müəyyən edilməsi.
2. Yeni proqram vasitələrinin hazırlanması.
3. Kadrların yeni tələblər səviyyəsində hazırlığı.

Sonuncu problem-kadrların hazırlığı digər 2 problemdən daha mürəkkəb və mühümdür. Qeyd etməliyik ki, bir çox pedaqoji kadrların yeni informasiya-təhsil mühitində iş səriştəsi və psixoloji hazırlığı zəifdir. Ali təhsil sistemində pedaqoji kadrların İKT səriştəliliyinin yüksəldilməsi problemi hələ də öz real həllini tapmamışdır.

İstənilən təhsil səviyyəsinin, o cümlədən ali təhsil sisteminin informatlaşması üçün ilk növbədə belə bir konsepsiya

hazırlanmalıdır. Bu konsepsiyanın hazırlanmasından sonra ali təhsil sisteminin informatlaşması konsepsiyası hazırlana bilər. Bu konsepsiyada bir çox texniki və texnoloji məsələlərlə yanaşı pedaqoji kadrların İKT səriştəliliyi konkretləşməli, onun reallaşmasının konkret yolları müəyyənləşməlidir. Müəllim bilməlidir ki, kompüterin imkanlarından harada, hansı məqsədlə və necə istifadə etsin, bu məqsədlə hansı proqram vasitələrini tətbiq etsin.

Ali təhsilin informatlaşması prosesinin təşkili də səmərəli qurulmalıdır. Çox vaxt universitetlərdə informatlaşmanın səviyyəsi burada olan kompüterlərin sayı ilə müəyyən edilir. Nəticədə, universitetdə kompüterlərin sayının artmasına baxmayaraq, təlimin keyfiyyətində yüksəlişə nail olunmur, bəzi hallarda isə keyfiyyət daha da zəifləyir. Bu vəziyyət tədris prosesinə elmi yanaşmanın olmaması, metodik, təşkilati və texniki problemlərlə, təhsil haqqında müasir elmlərin nailiyyətlərinə diqqət yetirməməklə əlaqədardır. Nəticədə, təhsilin informatlaşmasına tələbə və pedaqoji heyətdə qeyri-ciddi münasibət yaranır. Bunun aşağıdakı kimi səbəbləri var:

1. Ali məktəblərin İT-dən istifadəyə dair vahid metodologiyası yoxdur. Bu proses konseptual və məqsədli proqram layihələr əsasında deyil, kortəbii, sistemsiz aparılır.

2. Belə mürəkkəb elmi-texniki sahənin inkişafı daha çox maliyyə yardımı tələb edir. Bu problemlərlə əlaqədar Dövlət Proqramları qəbul edilib. Ümidvarıq ki, universitetlərə bu sahənin inkişafı üçün maliyyə ayrılacaq.

3. Təhsilin informatlaşması üzrə kadr təminatı hələ qənaətləndirici deyildir. Təhsilin informatlaşması xüsusi bir fəaliyyət sahəsidir, bu işi nə İT mütəxəssisləri, nə də pedaqoqlar keyfiyyətlə reallaşdıra bilər. Bu sahənin mütəxəssisləri pedaqoji informatika, elektron pedaqogika üzrə ixtisaslaşmalıdırlar. Rusiya Federasiyasının, Türkiyə Cümhuriyyətinin universitetlərində bu profilli kadrlar 10 ildən artıqdır ki, hazırlanır. Aydındır ki, peşəkar olmayan yerdə, təbii ki, işin nəticəsi ola bilməz. Bu gün universitetlərin təhsilin informatlaşması üzrə beynəlxalq təcrübəni mükəmməl bilən peşəkar kadrlara ciddi ehtiyac hiss olunur.

4. Təhsilin informatlaşması üzrə universitetlərdə infrastruktur yoxdur. Bəzi universitetlərdə elementar səviyyədə müəyyən strukturlar var, lakin maliyyə qıtlığı səbəbi ilə bu işə peşəkarların cəlb edilməsi və ya yeni kadrların hazırlanması problemlidir (müqayisə üçün qeyd edək ki, inkişaf etmiş universitetlərdə İT departamentdə işləyənlərin ümumi sayı 100-300 arasında dəyişir, onların əksəriyyəti yüksək səviyyəli İT mütəxəssisidir).

5. Proqram təminatın və metodik təminatın hazırlanmasında ali təhsil müəssisələri arasında əlaqələndirmə və iş birliyi zəifdir.

Ali təhsilin informatlaşması prosesinin təşkili və idarəedilməsi məqsədi ilə bir sıra aktual problemləri həll etmək lazımdır. Ali təhsilin informatlaşması aşağıdakı məqsədlərə xidmət edir:

1. Gələcək mütəxəssislərin İT-nin tətbiqi şəraitində peşə fəaliyyətini səmərəli qurmaq.

2. İT-nin tətbiqi əsasında mütəxəssis hazırlığı səviyyəsinin yüksəldilməsi, bu məqsədlə konkret təşkilati-metodik tədbirlər əsasında təlim texnologiyalarını təkmilləşdirmək.

3. Gələcək mütəxəssislərin müasir tələblər səviyyəsində hazırlanması üçün peşə təhsil proqramlarından səmərəli istifadə etmək.

4. Təlim prosesinin səmərəliliyini yüksəltmək məqsədi ilə İT-na əsaslanan mütərəqqi təlim metodlarından istifadə etmək.

5. Ali məktəblərdə aparılan elmi-tədqiqatların informatlaşma vasitələri ilə təmin edilməsi.

6. Ali məktəbin idarə edilməsində yeni texnologiyaların tətbiqi.

Ali peşə təhsilinin informatlaşmasının əsas məqsədlərinə nail olmaq üçün aşağıdakı məsələlər həll edilməlidir:

1. Tədris kursları və proqramların hazırlanmasında, tətbiqində informatlaşma məsələlərinin nəzərə alınması.

2. Ali təhsilin informatlaşma prosesinin tələbləri nəzərə alınmaqla mövcud kvalifikasiya (ixtisas) xarakteristikalarının təkmilləşdirilməsi.

3. Ali təhsilin tələbələrin qabiliyyətindən asılı olaraq İT-nin tətbiqi ilə diferensiallaşması.

4. İnformasiya vasitələrinin proqramlaşmanı bilməyən tələbə və müəllimlər tərəfindən sərbəst istifadəsi üçün adaptasiya edilməsi, sadə interfeysə malik olması.

5. Təhsilin informatlaşması vasitələrinin hazırlanmasına sərf edilən maliyyəyə və vaxta qənaət edilməsi.

6. Ali peşə təhsili sistemində tələbələrin yüksək fəaliyyət stimullarının müəyyənləşdirilməsi və ondan praktik istifadə edilməsi.

Bu məsələlərin səmərəli həlli ali təhsilin planlaşdırılmış nəticələrinin əldə edilməsinə əlverişli şərait yaradır.

Təhsildə intellektual kompüter texnologiyaları öz layiqli yerini almalıdır. Bir çox qabaqcıl universitetlərdə reallaşan innovasion təhsil layihələrinin əsas məqsədlərindən biri intellektual təhsil texnologiyalarının (İTT) geniş tətbiqi ilə tədris, elmi və praktik yönümlü məsələlərin əlaqəli həlli, bu prosesdə müəllim və tələbələrin çoxplanlı əməkdaşlığının yaradılmasıdır. Bunun nəticəsində insan kapitalının formalaşması daha intensiv xarakter ala bilər. İntellektual təhsil texnologiyaları (İTT) dedikdə, tədris-tədqiqat fəaliyyəti nəticəsində yeni intellektual məhsulun yaradılması nəzərdə tutulur. Bu texnologiyalar öyrənənlərdə (tələbələrdə) yeni intellektual xüsusiyyətlərin və yeni biliklərin yaradılması üsullarını formalaşdırır. İTT səmərəli müasir təhsil texnologiyalarının tam bir sistemə inteqrasiyasını nəzərdə tutur. İTT İKT-nin və digər təhsil texnologiyalarının fəal tətbiqi nəticəsində tələbə və müəllimin qarşılıqlı əlaqələrinin müxtəlif alqoritmlərini əhatə edir. İntellektual TPP yaradılmasının əsas məqsədi öyrənilən fənn haqda biliklərə, təlim metodikasına və tələbə haqqında müfəssəl məlumatlara əsaslanaraq təlim prosesini çevik və adaptiv idarəetməkdir. İntellektual TPP fənn haqda biliklərə və tələbə haqqında müfəssəl məlumatlara əsaslanaraq təlimin hər addımında tələbəyə optimal təsir ssenarisini müəyyən edir. İntellektual TPP-i şərti olaraq bu qruplara ayırmaq olar:

1. Biliklər bazası (təlim metodikası və tələbə haqqında müfəssəl məlumat) və tələbə modeli əsasında təlimi idarə edən intellektual öyrədici sistemlər. Bu sistemlər təlimin hər addımında tələbəyə optimal öyrədici təsiri müəyyən edir.

2. Hipermedia sistemi-bu sərbəst təlim rejiminə əsaslanır. Biliklər bazası fənnin semantikasına əsaslanan mürəkkəb şəbəkədir. Şəbəkənin qovşaqları (düyünləri) problem sahənin (fənnin) obyektləri, qövslər onların rabitələridir (əlaqələri). Tələbə belə bir şəbəkə üzrə irəlilədikcə fənni müstəqil öyrənir. Təlim mühiti tələbəyə tam sərbəstlik verir.

Təhsildə intellektual kompüter texnologiyaları təhsilin informatlaşmasının perspektiv məqsədləri olub, distant təhsil texnologiyaları vasitəsi ilə daha səmərəli reallaşa bilər.

***Rəyçi: p.ü.e.d. İ.İsmayılov***

## İstifadə edilmiş ədəbiyyat

1.Компьютерное моделирование в образовании. http://gisap.eu/ru/node/18917

2. Əhmədov İ. İnformasiya Cəmiyyəti. Təhsil. İnnovasiya. "Dirçəliş-XXI əsr" jurnalı, №108-109, 2007.

3. Əhmədov İ. Təhsilin qloballaşması və Milli Universitetlər. "Dirçəliş-XXI əsr" jurnalı, №130-131, 2009.

4. Ахмедов И. Дидактические основы дистанционного образования. Pedaqoji Universitetin Xəbərləri. Bakı, 2004, №3, (təbiət elmləri seriyası).

5. Гершунский В. Компьютеризация в сфере образования. М., 1987.

6. Гусев В., Образцов П., Некотихин В. Информационные технологии в образовательном процессе вуза. г. Орел, 2007 .

7. Интернет технологии в обучении. Томск, 2012.

**И.Ахмедов,**
**Н.Мамедова**

**О применении компьютерных технологий**

**Резюме**

Основной инструмент современной образовательной системы информационные технологии (ИТ). Создание, развитие и использования ИТ является важным компонентом стратегического плана страны. Показывается, что направление и интенсивность вычислительной техники, перемена в современных стадиях развития телекомуникации определяются не только возможностями програмных средств, а также профессиональном уровне владения ими людей, их готовности периодическим изменениям, инновациям и новостям в этой области. Рациональная информатизация страны берет начало от информатизации образования. По этой причине информатизация образования являетсяприоритетной задачей для всех стран.

**I.Ahmadov,**
**N.Mammadova**

**Applying computer technologies**

**Summary**

The main instrument of the modern education system is the information technologies (IT). Creation, development and application of IT strategy is an main part of country development strategy. However, the intensity of the development and application of innovation to a greater extent depends on the level of human capital rather than on the tecnical supply of processes. The effectiveness of the country's informatization begins on informatization of education. Therefore, informatization of education is a priority for many countries.



# TƏDQİQATÇILIQ HƏYATİ BACARIQLARA YİYƏLƏNMƏYİN ƏSAS ŞƏRTLƏRİNDƏN BİRİ KİMİ

**Zeynəb Məmmədova,**
***Azərbaycan Respublikası Təhsil İnstitutunun Ümumi təhsilin və məktəbdənkənar təhsilin kurikulumu şöbəsinin böyük elmi işçisi***

***Açar sözlər:*** *tədqiqatçılıq, təlim, nəticəyönümlülük, tədqiqat, bacarıq, fəaliyyət, bacarıqlar.*

***Ключевые слова:*** *содержание, направленность на результат, обучение, исследование, проект, деятельность, навыки, умения.*

***Key words:*** *maintenance, training, focus on results, research, project, skills, activity, ability.*

Müasir dövrdə təhsildə aparılan islahatın əsas istiqamətlərindən biri şagirdlərin müstəqil fəaliyyətinin, özünütəhsilin inkişafına hədəflənib. Şagirdlərdə öyrənməyi öyrənmək bacarığının inkişaf etdirilməsində tədqiqatçılıq metodu xüsusi rola malikdir. Tədqiqatçılıq metodunun əsas mahiyyəti ondadır ki, təlim şagirdlərin yaddaşının təkcə yeni elmi biliklərlə (informasiya ilə) zənginləşdirilməsinə deyil, həm də təfəkkürün müntəzəm inkişaf etdirilməsi əsasında daha çox biliklərin müstəqil əldə edilməsi, mənimsənilməsi, ən mühüm bacarıq və vərdişlərin, şəxsi keyfiyyət və qabiliyyətlərin qazanılmasına şərait yaradır. Bu zaman şagirdlər müəllimin rəhbərliyi altında, xüsusi seçilmiş, anlaşılması əhəmiyyət kəsb edən, yaradıcılıq qabiliyyətlərinin inkişafına səbəb olan ən vacib təlim materialının öyrənilməsi prosesində fakt və hadisələrin səbəb-nəticə əlaqələrini, qanunauyğunluqlarını aşkar etmək, nəticə çıxarmaq və ümumiləşdirmələr aparmaq bacarığına yiyələnirlər. Şagirdin mövqeyi – “kəşf edən”, “tədqiqatçı” mövqeyidir. O, gücü çatdığı məsələlər və problemlərlə üzləşərkən bunları müstəqil tədqiqat prosesində həll edir. Şagirdlər təlim prosesinin tamhüquqlu iştirakçısı olaraq, bu prosesdə tədqiqatçı kimi çıxış edirlər, bilikləri fəal axtarış və kəşflər prosesində mənimsəyirlər. Bu baxımdan aşağı siniflərdə emprik təfəkkürün, yuxarı siniflərdə isə nəzəri təfəkkürün inkişafına üstünlük verilir. Tədqiqatçılıq metodu hər iki təfəkkürün inkişaf etdirilməsində xüsusi əhəmiyyət daşıyır. Ona görə də tədqiqatçılıq metodundan istifadəni fizikanın tədrisinə başlandığı andan əlverişli hesab etmək olar.

Müasir təlimin tələblərinə uyğun olaraq tədqiqatçılıq metodu xüsusi əhəmiyyətə malikdir. Şagirdlərdə həyati bacarıqların inkişafı ətraf aləmdə baş verən hadisələri nəzəri və eksperimental şəkildə tətbiq etməklə təmin olunur. Bu metod şagirdlərin yaradıcılıq qabiliyyətinin aşkar edilməsi üçün böyük əhəmiyyət kəsb edir. Lakin fizikanın tədrisi prosesində ondan istifadə həmişə mümkün olmur. Standartın tələbi və ona uyğun məzmun imkan verdiyi halda tədqiqatçılıq metodundan istifadə etmək mümkündür. Eyni zamanda, onu da qeyd etmək istərdik ki, sinifdəki şagirdlərin psixoloji durumu və bacarıqları onun tətbiqinə imkan verməlidir.

Görkəmli fizik Ceyms Klerk Maksvell demişdir ki, təlim zamanı o halda məqsədə çatmaq olar ki, şagirdlərə qazanıl-

mış bilik, bacarıqlar hesabına təbiətin və həyatın onların qarşısına qoyduğu suallara cavab almağa imkan verilsin. Bu bilik və bacarıqların qazanılma səviyyəsi hər bir şagirdin idraki imkanlarından asılıdır. Qeyd etdiyimiz kimi, şagirdlərin maraq dairəsindən asılı olaraq bilik, bacarıqlara yiyələnməsinin dərinliyi müstəqil tədqiqatçılıq hesabına mümkündür. Tədqiqatın aparılması prosesində faktlar toplanılır, fərziyyə irəli sürülür, eksperimentdə yoxlanılır, tətbiq olunur, şagird öyrəndiyi hadisənin, qanunun, anlayışın, kəmiyyətin mahiyyətini dərindən dərk etməklə daha yüksək səviyyədə bacarıqlara yiyələnmiş olur.

Tədqiqatçılıq metodundan istifadə etməklə işi bir neçə istiqamətdə daha da səmərəli etmək mümkündür:

- yeni yanaşma vasitəsilə, şagirdlərdə hafizədən təfəkkürə keçidi təmin etməklə;
- inteqrasiya imkanlarını genişləndirməklə;
- təlimin üç əsas - tərbiyəedici, təlimverici və inkişafetdirici funksiyalarını nəzərə almaqla;
- fənnin tədrisinin praktik istiqamətini gücləndirmək məqsədilə təlimin metod və vasitələrindən istifadə etməklə;
- iştirakçıların bütün dərs zamanı fəallığını təmin etməklə;
- tədqiqat xarakterli tapşırıqlardan istifadə etməklə.

Tədqiqat tələb edən tapşırıqlardan istifadə şagirdlərdə məntiqi, tənqidi və yaradıcı təfəkkürün inkişafına zəmin yaratmaqla bərabər, onlarda sosial bacarıqların inkişafına imkan yaradır:

- qarşıya qoyulmuş məqsədə çatmaq üçün işin birgə həlli yollarını müəyyənləşdirmək və qərar qəbul etmək;
- əməkdaşlıq etmək (başqaları ilə işləməyi bacarmaq, ümumi məqsədə çatmaq üçün düzgün iş bölgüsü aparmaq);
- müstəqil düşünmək, sərbəst fikir söyləmək;
- öz təcrübəsini və biliyini təhlil etmək;
- özünü qiymətləndirmək;
- başqalarını dinləmək, müxtəlif fikirlərə hörmət etmək və tolerant olmaq;
- öz fikirlərini arqumentlərlə izah və sübut etmək və s.

Şagirdlərdə tədqiqatçılıq bacarıqlarının inkişafı həmişə fizikanın öyrənilməsində aktual problemlərdən olmuşdur. Ənənəvi təhsildə fizikanın öyrənilməsi dövrilik prinsipinə əsaslanırdı (fakt, model, tədqiqat, eksperiment). Yeni təhsil islahatının tələblərinə görə isə tədqiqatçılıq dərketmənin səviyyələrinə (bilmə, anlama, tətbiq, analiz, sintez və dəyərləndirmə) əsaslanır. VI sinifdə nəzərdə tutulmuş 3.1.1. Sadə ölçü cihazlarından istifadə edir. 3.1.2. Sadə təcrübələr aparır, nəticələrini təqdim edir standartları reallaşdırılarkən şagirdlərə aşağıdakı tapşırığı yerinə yetirmək tapşırılır. Bədən üzvlərinizdən bir barmağın enini, uzunluğunu, ayaqlarınızın uzunluğunu və qarışınızı ölçüb nəticələri cədvəldə qeyd edin.

| **Bədən üzvlərimiz** | **Uzunluğu (sm-lə)** |
|---|---|
| **Barmaq** | |
| **Ayaq** | |
| **Qarış** | |
| **Addım** | |

Bundan başqa onlara otağınızın eni və uzunluğunu heç bir ölçü cihazlarından istifadə etmədən ölçmək tapşırılır. Tapşırıq addımlarla icra edilir. Alınan nəticələr metrlə ifadə olunur. Nəticələrini iş vərəqlərinə qeyd etmək və həmin nəticələri ölçü lenti ilə apararaq müqayisə etmək tapşırılır. Bu zaman şagirdlərdə ölçmə, dəqiqlik, ölçü cihazlarından sərbəst istifadə etmə, səbirlilik, fikrini sərbəst ifadə etmək kimi bacarıqlar inkişaf etdirilir.

2.1.1. Maddələri quruluşuna (aqreqat hallarına) görə fərqləndirir standartının tələblərinə uyğun şagirdlərə tərəfləri 1sm olan taxta tirciyin və plastilin kubun kütləsini elektron tərəzidən istifadə edərək

ölçmək tapşırılır. Əvvəlcə, taxta tirciyin, sonra isə plastlin kubun həcmini, kütlə və sıxlığını iş vərəqlərində qeyd etmələri tapşırılır. Təcrübənin aparılması zamanı şagirdlərə aydın olur ki, plastlin eyni həcmli taxta tircikdən ağırdır. Şagirdlər cisimlərin kütləsini, həcmlərini müəyyən etməklə, sıxlığı təyin edən zaman biliklərinin kontekstinə çatmış olurlar. Belə tapşırıqların icrası zamanı onlar dəqiqlik, ardıcıllıq, hesablama, səliqəlilik, dözümlülük, cihaz və avadanlıqlardan təyinatına uyğun düzgün istifadə etmək, təqdim etmək bacarıqlarına yiyələnirlər.

2.1.3. Materiyanın formalarına dair müşahidələrini sadə şəkildə təqdim edir.

2.1.4. Maddələrin quruluşuna (aqreqat hallarına) dair sadə məsələlər həll edir standartları reallaşdırılarkən şagirdlərə menzurkaya yarısına qədər marqans məhlulu töküb, üzərinə ehtiyatla saf su əlavə etmək tapşırılır. Onlara prosesi izləmək, və müşahidə etdiklərini və suyun rənginin dəyişməsinin səbəbini müəyyən etmək tapşırılır.

Bu tapşırığı yerinə yetirən zaman şagirdlər paltarlarının zövq oxşayan rəngə boyanmasının diffuziya nəticəsində olduğunu müəyyən edəcəklər. Onlarda diqqətlilik, dəqiqlik, təhlükəsizlik qaydalarına əməl etmək, sərbəst nəticə çıxarmaq kimi bacarıqlar formalaşır.

Fizikanın tədrisi zamanı təlimin səmərəli olması üçün yeni yanaşmalar və metodlar tətbiq olunur. Belə metodlar tətbiq olunan dərslərdə yeni biliklər anlaşıqlı olur, şagirdlərin idraki fəaliyyətləri qüvvətlənir, onlar arasında kommunikativ bacarıqlar formalaşır, ən başlıcası isə qazandığı baza biliklərinin köməyi ilə həyatda rast gəldiyi məsələlərin həllində yaradıcılıq nümayiş etdirə bilirlər.

Şagirdlərdə tədqiqatçılıq bacarıqlarının formalaşdırılması onlarda həyati bacarıqların inkişaf etdirilməsinə imkan yaradır.

***Rəyçi: dos. Ə.Abbasov***

## İstifadə edilmiş ədəbiyyat

1. Süleymanova A. Müasir kurikulumlarda yeni təlim yanaşmalarının tarixi kökləri. Kurikulum, 2008, №2.
2. Abbasov Ə. Yeni kurikulumların səciyyəvi xüsusiyyətləri. Kurikulum islahatı: tədqiqatlar, nəticələr. Bakı, 2011.
3. Соколова О. Испарение и конденсация. Физика в школе, 2014, № 4.
4. Balaqadaşova C. Layihə işlərinin təqdimatı üçün meyarlar və rubriklər. Kurikulum, 2016, №1.
5. https://www.pinterest.com/source/teacherspayteachers.com/
6. theteacherschair.blogspot.com/

**З.Мамедова**

**Исследование одно из основных условий овладения жизненными навыками**

**Резюме**

В статье рассказывается о сущности заданий исследовательского характера способствующими формированию у учеников жизненных умений. Сегодня ученик «первооткрыватель», «исследователь» в учебном процессе. Поэтому очень важно использование исследовательского метода на уроках физики.

**Z.Mammadova**

**The study is one of the main conditions of mastering life skills**

**Summary**

The article in physics classes, students' research skills vital importance of character and spoken instructions. It is clear today that the learning process of students, "who discovered", "researcher" is. In this regard, the method of research in the teaching of physics can be considered favorable.



# TƏDRİSDƏ MOTİVASİYA VƏ İKT-DƏN İSTİFADƏNİN ƏHƏMİYYƏTİ

**Gözəl Mustafayeva,**
***Heydər Əliyev adına liseyin müəllimi***

Məqalədə coğrafiya fənninin tədrisində motivasiya-problemli vəziyyət yaradaraq öyrənmənin və bu zaman İKT resurslarından istifadə etməyin müəllim və şagird üçün əhəmiyyəti vurğulanmışdır.

***Açar sözlər:*** *motivasiya, informasiya texnologiyaları, internet, coğrafiya, nümayiş üsulu, kompüter, vizual görüntülər.*
***Ключевые слова:*** *мотивация, информационные технологии, интернет, география, демонстрирующие метод, компьютер, визуальные съемки.*
***Key words:*** *motivation, information technology, internet, geography, demonstrating a method, computer, visual shooting.*

Motivasiya fəal dərsin ən mürəkkəb və mühüm mərhələsidir. Çünki dərsin gedişi, ilk növbədə, motivasiyanın necə keçirilməsindən asılıdır. Motivasiyanın yaradılmasının müxtəlif yolları vardır. “Motivasiya” latın sözü olub “sövqetmə”, “oyatmaq” mənası verir. Motivasiya insan münasibətlərinə istiqamət verən ən önəmli amillərdən sayılır. Motivasiya yaradılaraq şagird düşünməyə məcbur edilməli, o, fəaliyyətinə həvəsləndirilməli, müəllim sualları yönəldici səmtə istiqamətləndirilməli, şagird təfəkkürünün inkişaf etdirilməsinə şərait yaradılmalıdır. Suallar, əsasən, təfəkkür prosesini aktuallaşdıran şəkildə qurulmalıdır. Belə suallar müxtəlif zamanlarda müxtəlif xarakterdə ola bilər.

XXI əsrdə həyatımızın bütün sahələrində yaşanan sürətli inkişaf dünyanı qlobal bir məkan halına gətirmişdir. Bu da insan və məkan əlaqələrini araşdıran coğrafiyanın tədrisinin əhəmiyyətini artırmışdır.

Coğrafiya insanlıq tarixi qədər qədim olan bir elmdir. Yerin müxtəlif ərazilərinin təbii şəraiti və təsərrüfatı haqqında insanların konkret biliklərə olan praktik tələbatı hələ uzaq keçmişdə coğrafiyanın meydana gəlməsinə səbəb olmuşdur. Hər bir xalq öz ölkəsi, həmçinin başqa ölkələr haqqında ən zəruri faktiki biliklərə yiyələnməyə can atırdı. Müasir dövrdə coğrafiya təkcə şəhər, göl, çay adlarının əzbərlənməsi üçün deyil, düzgün üsul və vasitələrlə öyrənilərək, proqnozvermə, dəyərləndirmə, müqayisəetmə, səbəb-nəticə əlaqələrini qurma kimi vacib bacarıqlar formalaşdıran bir elmə çevrilməkdədir.

Bu səbəbdən öyrənmə prosesində şagirdin dərsə qarşı olan motivasiyası hədəflərə çatılması baxımından əhəmiyyətli bir faktordur. Motivasiya istəkləri, arzuları, tələbləri, impulsları və maraqları əhatə edən ümumi bir anlayışdır. Motivasiya termini mənşəcə latın sözü olub, hərəkət mənasına gələn “avtor” sözündən götürülmüşdür. Motivasiya - bir işi bacarmaq üçün lazımlı olan istəyi o işi edəcək kəslərdə yaratmaq və şiddətləndirmək deməkdir. Motivasiyanı meydana gətirən üç faktor var: tədrisi nəzərdə tutulan mövzunu başlamaq, istiqamətləndirmək və inkişaf etdirmək.

Motivasiya fərdi bir hadisədir. Birini motivasiya edən hər hansı bir vəziyyət və ya hadisə başqasını motivasiya etməyə bilər. Şagirdin məktəbdəki müvəffəqiyyəti təhsil sisteminin keyfiyyətinin göstəricisi olaraq

olduqca əhəmiyyətlidir. Şagirdlərin coğrafiya dərslərindəki müvəffəqiyyətlərinə təsir edən faktorlardan biri də dərsdə qurulmuş məqsədəuyğun motivasiyadır. Bu səbəbdən coğrafiya dərsində şagirdlərin öyrənmə prosesində motivasiya səviyyələrinin nəzərə alınması olduqca faydalıdır.

Motivasiya şagirdlərin gündəlik həyatdan götürülmüş gerçək, ya da gerçəyə yaxın problemləri qruplar halında əməkdaşlıq içində həll etməyə çalışdıqları bir öyrənmə yanaşmasıdır. Bu yanaşmanın bir çox faydaları olmasına baxmayaraq, bunların içərisində ən əhəmiyyətlisi şagirdlərə öyrənməyi öyrətməkdir. Bu yanaşmada şagirdlər əldə etdikləri məlumatları istifadə edərək problemləri həll etməyə çalışdıqları üçün problem ilə əlaqədar mövcud məlumatları araşdırma və bunları şərh bacarığını da qazandırır.

Şagirdlər özləri üçün müəyyən bir məna daşıyan problemləri həll etmək üçün yaradılmış motivasiyaya maraq göstərirlər. Onlar bu problemi həll etməkdən ötrü məlumatları axtarır, tapır, onlar arasında əlaqələr qurmağa çalışırlar.

İllərlə coğrafiya fənni izahat və sual-cavab üsulları ilə tədris edildiyindən şagirdin dərsə qarşı marağının zəifləməsinə səbəb olmuşdur. Dərsləri beynəlxalq təcrübə əsas götürülməklə modernləşdirmənin tələbləri səviyyəsində təşkil etməklə kompüterdən istifadənin imkanları daha genişdir.

Coğrafiyanın tədrisində nümayiş üsulunun əhəmiyyəti danılmazdır. Bu üsulla müxtəlif fakt və hadisələri göstərərək izah etmək və açıqlamaq çox effektli nəticələr verir. Bu fənnə aid mövzular, ümumiyyətlə, vizual olduğu üçün nümayiş üsulu coğrafiyada tez-tez müraciət edilən üsullardandır. Nümayiş üsulu şagirdləri əzbərçilikdən uzaqlaşdırmaqda, mənimsəmənin və yaddasaxlamanın təmin edilməsində ən təsirli vasitələrdən biridir.

Coğrafiyanın tədrisində internet, kompüter və coğrafi məlumat sistemləri kimi müxtəlif texnologiyaların istifadəsi indiki dövrdə daha aktualdır. Bu da onunla əlaqədardır ki, şagirdlər tələb olunan bilik və bacarıqlara yiyələnmək, müəllimlər isə təhsil proqramlarında verilmiş standartları reallaşdırmaq üçün kompüter və internetdən istifadə edirlər. Standarta və məqsədə uyğun olaraq seçilmiş elektron materiallar, öyrədilən mövzunu canlı hala gətirir, dərsi zənginləşdirir, şagirdlərin maraq sahələrini genişləndirir və öyrənmə motivasiyasını yüksəldir. Kompüter, müxtəlif təhsil proqramları, internet kimi texnologiyaların, xüsusilə Google earth, Google Map və CBS kimi məkan öyrənmə proqramlarının coğrafiyanın tədrisinə xüsusi faydası onunla izah olunur ki, bu kimi texnologiyalar şagirdlərin xəritə oxuma və tərtib etmə bacarıqlarını inkişaf etdirir.

Müəllim coğrafiyanın tədrisi zamanı İKT-dən istifadə etməklə şagirdlərdə zehni inkişafa kömək edir.

***Rəyçi: dos. H.Cəfərov***

**Г.Мустафаева**

**Мотивация в обучении и польза от применения ИКТ**

**Резюме**

В статье говорится о важности учебной мотивации в преподавании географии создавая проблемную ситуацию, и используя ресурсы ИКТ.

**G.Mustafayeva**

**The importance of motivation and İCT in education**

**Summary**

The article said about the importance of geography teaching and learning motivation, creating a problematic situation and use İCT resources for teachers and students value.



# TƏLİMDƏ ŞƏXSİYYƏTYÖNÜMLÜ MÜHİTİN YARADILMASI

**Aygün Cavadova,**
***Nərimanov rayonu, 82 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *təlim nəticələri, şəxsiyyətyönümlü təlim, multimedia vasitələri, kompüter texnologiyaları.*

***Ключевые слова:*** *результаты обучения, обучение, направленное на личность, средства мультимедии, компьютерные технологии.*

***Key words:*** *the result of the teaching, process for each person, the ways of multimediya, the computer technology.*

Müstəqillik illərində təhsilin inkişafına xüsusi diqqət yetirilir, proqram və dərsliklərdə ciddi keyfiyyət dəyişikliyi yaradılır, dünya təhsilinə inteqrasiya ön plana çəkilir. Bu gün uğurla və yaradıcılıqla davam etdirilən kurikulum islahatları özünün ilk uğurlu nəticələrini verməkdədir, çünki dövlət tərəfindən təsdiq olunan Milli Kurikulumda ümumi təhsilin hər bir səviyyəsinin məqsədləri, ayrı-ayrı fənlərə verilən tələblər konkret müəyyən olunmuşdur. Bu təhsil sənədlərində əsas prinsiplərdən biri də nəticəyönümlülük prosesidir. Bunun əsas mənası odur ki, yeni yanaşmaya görə təlim nəticələri fənlərə görə deyil, əksinə, fənlər təlim nəticələrinə görə təyin olunur. Yəni tədris olunan fənlər əvvəlcədən müəyyənləşdirilmiş təlim nəticələrinin reallaşdırılması üçün bir vasitə rolunu oynayır.

Nəticələrin uğurlu olması hər bir müəllimdən və məktəb rəhbərinin işə münasibətindən çox asılıdır. Belə ki, təhsildə islahatyönümlü işlərin aparıldığı mərhələdə müəllimdən daha çox öyrənmək tələb olunur. Müasir müəllim yeni təhsil sistemində özünün şəxsiyyətyönümlü fəaliyyətinin mahiyyətini dərk etməli, humanist və demokratik təlim mühitinin yaradılmasına çalışmalı, cəmiyyətin, dövlətin, şagirdlərin ən çox etibar etdiyi bir insana çevrilməlidir.

Milli Kurikulumda şagirdin bir şəxsiyyət kimi formalaşması üçün lazım olan təlim şəraitinin yaradılması əsas məsələ kimi çıxış edir. Şagirdi müstəqil həyata tam sərbəst düşünən, fəaliyyət göstərən şəxsiyyət kimi hazırlamaq zamanın əsas tələbi olduğu kimi, müəllimin də əsas vəzifələrindən biridir. Müasir psixoloqlar şəxsiyyətin psixoloji xarakteristikasını müəyyənləşdirərkən təsdiq etmişlər ki, şəxsiyyət öz fəallığını fəaliyyətdə olduqda və ətraf aləmlə qarşılıqlı əlaqədə olduğu prosesdə hiss edir. Fəaliyyət mənbəyi onun tələbatlarıdır. İnsanın tələbatları isə tərbiyə prosesində formalaşır və o ictimai xarakter daşıyır. Bunları müəllim əvvəldən nəzərə almalı və hər an şagirdlərə də xatırlatmalıdır. Həyatda səmərəli fəaliyyət göstərmək üçün şagirdə lazım olan bütün bacarıqları formalaşdırmaq və inkişaf etdirmək təlim prosesində aparıcı istiqamət olmalıdır. Şagirdin idraki, hissi və psixomotor bacarıqlarını lazım olan istiqamətdə və səviyyədə

inkişaf etdirmək məqsədi ilə humanist və demokratik təlim mühitini yaratmaq mühüm əhəmiyyət daşıyır.

İndiyə qədər məktəbdə aparılan təlim, əsasən, şagirdlərin bilik səviyyəsinin və sadə idrak bacarıqlarının inkişafına yönəldiyindən indiki və gələcək tələblərə cavab vermirdi. Çünki müasir dövrdə şagirddə biliklərlə bərabər, qlobal düşüncənin formalaşdırılması tələb olunur. İnkişaf edən və dəyişən cəmiyyətdə zamanın tələbinə uyğunlaşmaq vacib və zəruridir. Bu uyğunlaşma, öncə cəmiyyətin əsasını təşkil edən məktəbdən başlamalıdır. Hazırda dərsini yalnız dərslik və sinif otağı ilə məhdudlaşdıran müəllim şagirdləri cəmiyyətdəki yenilik və inkişafdan saxlamış olur. Hansı ki bu gün öyrənmə tək kitablarla deyil, həm də mümkün olan digər resursların vasitəsi ilə aparılmalıdır.

İnformasiya-Kommunikasiya Texnologiyaları (İKT) təlim, tədris və təhsilin idarəçiliyi üçün mühüm vasitə kimi nəzərdə tutulur. Kurikulum islahatlarının geniş vüsət aldığı bir zamanda şəxsiyyətyönümlü təlimin təşkilində İKT-dən istifadə daha aktual olmalıdır.

Şəxsiyyətyönümlü təlimdə diqqət mərkəzində məhz öyrənənin olduğunu bilirik. Öyrənənin necə öyrənməsi isə həm onun özündən, həm də onu öyrədəndən asılıdır. Bugünkü interaktiv dərsdə şagird araşdırmaya cəlb edilməli, onun özü araşdıra-araşdıra öyrənməlidir. Bu prosesdə müəllimin rolu əvəzsizdir. Belə ki, müəllimin qurduğu dərs müasir standartlara cavab verdiyi halda, şagird mütləq araşdırmaya cəlb olunacaq. Təbii ki, araşdırma aparan, öyrənən də yalnız kitab və əyaniliklə kifayətlənməməli, qeyd etdiyimiz kimi internet resurslarından da istifadə etməlidir. İnternetdən məlumat topladan müəllimin şagirdləri özü öz fəaliyyətini istiqamətləndirir və müstəqil olurlar. Onlar hansı mənbələrdən istifadə etməyi və hansı əlaqələri qurmağı özləri seçir. Müəllimlərin müəyyən etdiyi parametrlərdən asılı olaraq şagirdlər öz mövzularına və apardıqları araşdırmalara nəzarəti tam şəkildə öz əllərində saxlaya bilir.

Kompüter proqramları şagirdlər üçün çeşidli seçimlər təmin etmək məqsədilə mətnləri, təsvirləri, səsləri və hərəkətləri birləşdirə bilər. Multimedia proqramları da yalnız sinifdə istifadə olunan resurs rolunu oynamayacaq, həm də şagirdlərin işinin zənginləşdirilməsinə və müxtəlifliyinə öz töhfəsini verəcək.

Kompüterlər fəal xarakterli işlərdə - məlumatların və resursların toplanılması, həmkarlarla söhbət, çətin məsələnin həlli və ya mühakiməyürütmə prosesində şagirdlərimizin köməyinə gələcək. Məsələn, e-poçt vasitəsilə onlayn söhbət etmək fəal əməliyyatdır və bu növ müzakirələr, adətən, sürətli mühakimə yürütməyi tələb edir. Bunlar şagirdə ideyalar haqqında düşünmək və öz anlayışlarımızı yoxlamaq imkanı verir.

Texnologiyaların təlim prosesində tətbiq olunması müştərək öyrənmə prosesini və şagirdlər arasında əməkdaşlığı inkişaf etdirir və onun bir şəxsiyyət kimi formalaşmasında mühüm rol oynayır. Şagirdlərə söhbət etmək icazəsi verilən zaman onların əksəriyyəti öz işləri haqqında danışır və öz strategiyalarını bir-biri ilə paylaşır. Sinif fəaliyyətlərinin strukturu elə tərtib olunub ki, burada kompüterlər öyrənənlərin ünsiyyət saxlamaq və öz düşüncələrini başqaları ilə paylaşmaq arzusuna uyğun olaraq onlar arasında əməkdaşlığı dəstəkləyir.

Multimedia vasitələrindən istifadə

olunması əyaniliyi gücləndirir, informasiyanın məntiqi və obrazlı mənimsənilməsi üsullarını birləşdirir ki, bu da təlim prosesini fəallaşdırır. Multimedia texnologiyalarının interaktivliyi şəxsiyyətyönümlü təlim modellərini gerçəkləşdirmək üçün geniş imkanlar verir.

İKT-dən istifadə edilən siniflərdə şagirdlərin məlumat toplamaq, həmkarları ilə məsləhətləşmək və əldə etdikləri nəticələri təqdim etmək üçün daha güclü vasitələri vardır. Şagirdlərin öz müəllimlərindən asılılığı azaldıqca və onların öz təşəbbüskarlığı artdıqca şagirdlərin müstəqilliyi və özünəinam hissi də artır. Texnologiya şagirdlərə məlumatları idarə etmək imkanı verir ki, bu da həm şagirdlərin anlama qabiliyyətini sürətləndirir, həm də onların daha yüksəksəviyyəli mühakimə bacarıqlarından istifadəyə keçməsini təmin edir. Şagirdlər həqiqi həyatla bağlı olan məlumatları topladıqca, əldə etdikləri nəticələri məktəbdən xaricdə olan öyrənənlərlə paylaşdıqca və bu nəticələri dərc etdikcə onların bu prosesdə rolu genişlənir. Onlar başqalarının əməyinin məhsullarını araşdıran şəxsdən öz şəxsi fəaliyyətini tərtib edən, müəlliflik edən, materialları təchiz edən və dərc edən şəxsə çevrilir.

Kompüter texnologiyasının dəyəri ondadır ki, bu təlim vəsaiti şagirdlərə öyrənmə prosesində "2x4 öyrənmə üsulunun", yəni kitabın iki üz qabığının arasındakı materialla və sinif otağının dörd divarı ilə məhdudlaşan öyrənmə üsulunun hüdudlarını aşmaq imkanı verir. Real həyat tapşırığını öyrənməyə və yenidən hasil etməyə şərait yaradan proqramlar vasitəsilə şagirdlər məlumat toplaya və kitabların dəstəkləmədiyi üsullarla öz təlimlərini davam etdirə bilər. Bu da onların bir şəxsiyyət kimi yetişməsində mühüm rol oynadığını göstərir.

Son olaraq onu vurğulamaq istərdim ki, kurikulum islahatının geniş vüsət aldığı bir zamanda şəxsiyyətyönümlü təlimin təşkilində İKT-dən istifadə daha keyfiyyətli təhsil, keyfiyyətli şagird, keyfiyyətli təlim nəticələrini əldə etməyə imkan verir.

***Rəyçi: prof. H.Əhmədov***

## İstifadə edilmiş ədəbiyyat

1. Təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı (2008-2012-ci illər üçün). http//e-qanun.az.

2. Ağayev Ə. Yeni təlim metod və texnologiyalarının nəzəri və praktik məsələləri. //ARTPİ-nin “Elmi əsərlər”i. Bakı, 2005.

3. Vəliyeva K. Kompüter dilçiliyinin müasir istiqamətləri. // İnformasiya cəmiyyəti problemləri. Elmi-metodik jurnal. 2016, №2.

**А.Джавадова**

**Создание среды личности в обучении**

**Резюме**

В статье говорится о роли ИКТ в образовании и развитии личности.

**A.Javadova**

**Creating personality environment in training**

**Summary**

This story is about the creative structure and abont the working process for everybody personality.